# ÖN SÖZ

İlk qələm təcrübələrinə bələd olan biri olaraq deməliyəm ki, Ramazan məktəb illərindən bu günə bəlli bir inkişaf, təkamül yolu qət edib. Onun bədii yaradıcılığa meyli hələ ibtidai siniflərdə oxuduğu vaxtdan nəzəri cəlb edirdi. İstər rəsm çəkməyi, istərsə də maraqlı süjetlər qurmaqla hekayələr yazmağı bədii təxəyyülünün geniş imkanlarından xəbər verirdi. Yaxşı yadımdadır, gərək ki, 9-cu sinifdə oxuyanda Azərbaycan dili dərsindəki tapşırıqların birində çətin vəziyyətdən çıxış yolu tapmaqla detektiv süjet hazırlamaq tələb olunurdu. Düzü, özünü və ətrafdakı insanları qorumaq şərtilə terrorçu dəstəni zərərsizləşdirib sui-qəsdin qarşısını almaq üçün qəfil qərar vermək mənə də çox çətin gəldi. Heç gözləmədiyim halda o, çox mürəkkəb şəraitdə problemin həllini ən qısa müddətdə elə yekunlaşdırdı ki, heyrətimi gizlədə bilmədim. Həmin gün bu oğlandakı işığı kəşf etdim.

Zaman keçdikcə Ramazanın qələmi daha da kamilləşir, müşahidə qabiliyyəti, hadisələri saf-çürük etmək bacarığı, humanist yanaşma bacarıqları təkmilləşir. O, gündəlik həyatda rastlaşdığı ən adi hadisələri insan haqları baxımından mənalandırır, problemlərin həllini "hüquq müstəvisi"nə daşıyır. İnsanı əzən, aşağılayan, cılızlaşdıran hər şey bu qələmin qəzəbinə düçar olur.

Tanış olacağınız bu kitabda toplanan və çox önəmli mövzuları əhatə edən hekayələr də bu günün oxucusunu məşğul edən məsələlərin həllinə yönəlib. Bu, məzmunca bir-birilə əlaqəli altı hekayənin yaratdığı orjinal süjetli, üç hissədən ibarət romandır. Birinci hissədəki dörd hekayə toplum üçün xüsusi əhəmiyyət kəsb edən sosial-iqtisadi və siyasi problemlərin bədii həllini ehtiva etməklə hüquq-mühafizə orqanlarındakı məmur özbaşınalığı və insan haqları pozuntularının təsvirilə yadda qalır. Müəllif köhnə cəmiyyətin tör-töküntüsü - "manqurt" ideologiyasının əsarətindən hələ də qurtula bilməyən çürük düşüncəli imkan sahiblərinin sağlam demokratik mühitin formalaşmasına necə mane olmasından söhbət açır.

Ədalətsizliyə barışmaz münasibət Ramazanın hekayələrinin qırmızı cizgisidir. Onun qələmində sonsuzluğa dayanan mübaliğənin müşaiyətilə haqsızlığın bütün təzahürləri və səbəb olduğu çoxsaylı faciələr diqqətə çatdırılır, ictimai ədalətsizliyin nə qədər böyük bəla olduğu sərgilənir. Narkotik bəlasına düçar olmuş zavallı Hüseynin "əlləri böyüklər ətəyində olan" qudurğan məmurun cinayətinin ört-basdır edilməsində vasitəyə çevrilməsini oxuyarkən müəllifin qəzəbi oxucunun duyğularına hakim kəsilir. Xatırlanır ki, xeyirlə şərin mübarizəsində insan həlledici qüvvədir. Onun şərin yanında dayanması nəinki bəşəriyyəti, hətta kainatı dəhşətli sonluğa sürükləyir. Bütün bəlaların kökü isə bəşər övladının düşünməkdən uzaqlaşmasıdır.

"Yanus" hekayəsində müəllif mistikaya müraciət edərək, Nağıyev obrazı vasitəsilə oxucunun diqqətini insanın ikili duyğularına yönəldir, insani və heyvani hislərin hər birimizdə var olduğunu göstərir. Bu hislər o qədər güclüdür ki, bütün həyatımızı idarə edir. Bəzən cinayət törətdiyi üçün özümüzü cəzalandıra bilirik, yəni qanuna ehtiyac olmur. Başqa sözlə, sağlam düşüncə hər cür qanundan önəmlidir.

Hansı mövqedə durmasından asılı olmayaraq, polis də, məmur da, nazir də, fəhlə də, prezident də ilk növbədə insandır və özünü dinləsə, daxili "mən"ini anlamağa çalışsa, yəni düşünə bilsə, insanlıq məhv olmaqdan xilas olar. Hansı məqam mənsubu olmasından asılı olmayaraq, insan ilk növbədə İNSAN olmalıdır. Bu təkcə vicdan məsələsi deyil, ədalət insanlığın ehtiyacıdır. Hekayələrdə mistikaya müraciət etməklə, heç bir cinayətin cəzasız qalmayacağı fikri kəskin şəkildə öz isbatına qovuşur. Vaxtilə "qılıncının hər iki tərəfi kəsən" yüksək vəzifə sahibləri sonda özlərilə üzləşdirilir, törətdikləri cinayətləri danmaq imkanından məhrum edilir və belə bir nəticəyə gəlinir ki, heç kəs ədalət divanından yaxa qurtara bilməz.

Kitabın ikinci hissəsi bir hekayədən ibarətdir. Silsilə hekayələrin ən maraqlı halqası "Ağ göyərçin"dir. Naqis düşüncəli insancıqların yaşadığı cəmiyyətdə seçki müşahidəçisi olan qəhrəmanı şahidi olduğu hadisələr dəhşətə gətirir. Seçki prosesindəki ağılasığmaz səhnələrin təsviri yenə də müəllifin haqsızlığa barışmaz münasibətinin təzahürüdür. Burada yuxarılara yaranmaq üçün dəridən-qabıqdan çıxan saxtakarlığın parlaq simaları: özünü xalq qəhrəmanlarının pərəstişkarı kimi təqdim edən, sonrakı səhnələrdə əyilə-əyilə, o yan-bu yana boylanaraq qoynundakı bülletenləri seçki qutusuna atan çoban Rüstəm, qəhrəmanın "təmiz qəlbli", sonradan qanunsuzluğun bir parçasına çevrilən sevgilisi, seçki qutularını "mühafizə edən" qadınlar kimi saxtakarlıq xəstələri oxucuda ikrah hissi yaratsa da, ümidsizliyə yol açmır, əksinə, ədalətsizliyə qarşı daha sərt dayanmağa, daha fəal vətəndaş mövqeyinə dəvət edir.

Sonuncu hissə də bir hekayədən ibarətdir və burada "Ağ göyərçin"dəki hadisələrin davamı - məmləkətin seçkilərdən sonrakı vəziyyətindən söhbət açılır. Distopik süjetli "Halqa" hekayəsində çox mühüm mətləblərin sətiraltı təsvirləri bir çox ictimai bəlaları gün işığına çıxarır. Hekayəni oxuyanda Sabirin "Necə mən dörddə birin yazmağa eymən deyiləm, Qorxur on dörddə birin yazmağa həm əhli qələm" - misralarını xatırlayırsan. Cəsarətli fikirlər irəli sürən hekayəni oxuyarkən oxucu dərhal düşünür ki, "Ağ göyərçin"dəki seçki məzhəkəsinin məntiqi nəticəsi bu cür boynu halqalı, daim xof içində, informasiya blokadasında sürü kimi yaşayan insanların həyat tərzi olmalı idi. Öz fikrini sərbəst şəkildə ifadə etmək haqqının tanınmaması bəşər övladının ən böyük faciəsi, insanın insana edə biləcəyi ən böyük pislikdir.

Milli müstəqilliyini əldə etmiş bir toplum olaraq, keçmişin hispasından arınmış, yeni, ədalətli, demokratik cəmiyyətin formalaşması üçün azad düşüncəli, milli dövlətçiliyimizin qorunmasında şüurlu şəkildə iştirak etməyə qadir, intellektual səviyyəli insanların yetişməsi şərtdir. Hekayələrin leytmotivini təşkil edən bu fikir yaşadığımız cəmiyyətin hər bir fərdinin üzərinə mühüm vəzifələr qoyur.

Özündən əvvəlki ədəbi irsə dərindən yiyələnmiş, Azərbaycan və dünya ədəbiyyatının öncül ənənələrinə yaxından bələd olan müəllif öz sətirlərində Nizaminin humanizm fəlsəfəsinin, Vaqif gerçəkliyinin, Cavid bəşəriliyinin, Mirzə Cəlil fəryadının, Vurğun milliliyinin, Ulutürk üsyankarlığının, Şəhriyar hüznünün izlərini yaşadır, yaratdığı sağlam özülün üzərində ilmələri ənənə və novatorluğun dayanışmasına əsaslanan alınmaz bir söz qalası ucaldır. Bütün zamanların başlıca mövzusu olan ədalət, insanpərvərlik Ramazanın bu kitabında varislik prinsipinə uyğun olaraq yeni ölçülərə daşınır, çağdaş dövrlə özləşir, günümüzün dərdlərinə tərcüman olur.

Kitabın hər cümləsində insanlığın xilas yolunu axtaran bir qəlbin çırpıntısı, yanğısı və inamı boy göstərməkdədir. Əminəm ki, bu, oxucunu, xüsusən, oxucu elitasını çox möhkəm silkələyəcək, düşündürəcək, bir çox dərin mətləbləri işıqlandırmaqla yatmışları oyadıb, "Ayə, mən kiməm?" - deməsinə vəsilə olacaq.

İlk olmasına baxmayaraq, kitabda toplanan hekayələr bədii cəhətdən də diqqətəlayiqdir. Dili çox sadə və axıcı olsa da, sətiraltı mənaların dərinliyi, rəngarəngliyi nəzəri cəlb edir. Bu isə oxuyub anlamaya heç də mane olmur. Əslində bu barədə çox söz demək olar. Oxuduqdan sonra daha maraqlı fikirlərin qeyd olunması üçün sözü əlahəzrət oxucuya veririk.

Möhtərəm oxucu, kitabı yalnız oxuma, düşün və fikir mübadiləsi et. Müəllif səni hər an dinləməyə və suallarını cavablandırmağa müntəzirdir.

Buraya qədər qeyd olunanlar deməyə əsas verir ki, ədəbiyyatımıza yeni nəfəs, yeni ruh, yeni qələm gəlir... Və bu kitab onu yazan qələm sahibinin zirvələrə aparan daşlı-kəsəkli, qarlı-küləkli, güllü-çiçəkli yolda ilk addımıdır. Ramazanın uğurlarına sevinən hər kəsin adından onunla zirvələrdə görüşmək diləyilə qələminə Adəm ömrü, Zülfüqar itiliyi, Babək dönməzliyi arzulayır və ilk qədəmlərini alqışlayıram.

*Xavər Məmmədova, müəllim.*

# MÜƏLLİFDƏN BİR NEÇƏ SÖZ

Yazdıqlarımda üç qüvvə var: xeyir, şər və mən. İlk ikisi arasındakı amansız mübarizədə gah xeyir tərəfdə yer alıb bütün gücümlə şərlə döyüşürəm, gah da əksinə, şər tərəfə keçib xeyirə qarşı yeni bir cəng elan edirəm. Bir də görürsən, dururam tən ortada, öz barrikadamı yaradıb hər iki tərəfi qatıram qabağıma. Bu, zamanla döngü yaradır və az qala hər kəs heydən düşüb silahını yerə qoyana, ya da meydanda leşlər qalaq-qalaq olana və quzğunları başına cəmləyənə qədər davam edir. Sonda isə hər şey başladığı nöqtəyə qayıdır və budur: mübarizə yenidən qızışır…

Hələ balaca vaxtı qardaşımla bir-birimizə söz vermişdik ki, böyüyüb cəmiyyəti xilas edəcəyik. Yaşımız az olsa da, geniş düşünürdük. Bunun üstündə saatlarla müzakirə aparır, müxtəlif məsələləri götür-qoy edirdik. Qanmırdıq. Balaca idik axı. Elə bilirdik, hər şey bu qədər sadədir. İçimizdə qəhrəman olmaq arzusu vardı və bu arzu hər şeydən güclü idi. Dörd il əvvəl, 13 dekabr günü, Kürdəmirə aparan maşında aşağıdakı sətirləri yaza-yaza təxmini bunları düşünürdüm:

"Bu gün qardaşım öldü. Bəlkə də, dünən ölüb, bilmirəm. Əmim zəng etmişdi, "Qardaşın vəfat etdi. Dəfn bu gündür."

Baş açmaq olmur, bəlkə də, elə dünən ölüb…"

Bunu hansı vəziyyətdə yazdığımı unutmuşam, amma hansı düşüncə ilə yazdığım hələ də yadımdadır. Qardaşımın ən sevdiyi və demək olar, hər yerə özü ilə apardığı, hətta baş obrazını mənə bənzətdiyi "Yad" romanının ilk cümlələrinə göndərmə etmişdim. Bu arada, həmin kitab da onun hekayələr yazdığı dəftər kimi yerli-dibli yoxa çıxmışdı.

Bu balaca, ilk baxışdan mənə mənasız görünən kitaba pul verdiyi üçün onu qınayırdım, o isə "Oxuyarsan bunu, Rama, özünü tapacaqsan" deyib dururdu. Kitabı tapa bilməyincə, yalnız keçən ilin yayında təzəsini alıb oxuya bilmişdim. Məncə, bənzətmədə yanılmışdı; bu məsələdə haqlı ola bilməzdi, çünki mən nihilist deyiləm. Yenə də bu bənzətməni nəyə əsasən etdiyini tam anlamış deyiləm, amma onun bənzətmələrdə nadir hallarda yanıldığı faktı məni daha da düşündürür. Heyif, kaş vaxtında özündən soruşardım…

Kitabda altını xətlədiyim bir abzas var:

"Bəli, mənim inamdan başqa heç nəyim yoxdur. Lakin bu inamı məndən heç kəs ala bilməz, necə ki, məni ondan ayırmaq olmaz."

Təxminən bir il əvvəl sinəmə döyə-döyə deyirdim: "Bütün aləm birləşsə belə, o – daxilimdəki inam və arzularımı, əlimdən alınmayacağı təqdirdə məni məhv edə bilməz…" İnsanları da iki yerə bölürdüm; bunun sayəsində yaşayanlar və bunun uğrunda ölməyi göz önünə alanlar. İndi isə üçüncü qismi də ayırıram – bunun uğrunda yaşayanlar.

Bəzən isə tənhalığa çəkilib özümə qarşı müharibə elan edirəm. O müharibənin sonunda qalib tərəf olmur, hər yan leş iyi verən düşüncələrlə qalaqlanır və nə vaxtsa yenə əlimə təklik düşəndə bu proses təkrarlanır. Vəziyyət elə bir həddə çatıb ki, geriyə dönüb yalnız yandırılmış körpü görürəm. Bu yolun geridönüşü yoxdur. İtirdiklərimə gəldikdə… Bu tamam ayrı mövzudur, buna görə qətiyyən peşman deyiləm. İdeyalarına sarılan və əlində bundan daha daimi nəsə olmayan insanların ortaq taleyidir bu.

Yadımdadır, qardaşım o vaxt anama sual vermişdi ki, "Körpü" filmindəki atanın yerində olsaydı, nə edərdi – körpünün çarxları arasında sıxışıb qalmış oğlunu mu, yoxsa yaxınlaşmaqda olan qatardakı yüzlərlə insanı mı qurtarardı? Anam cavab verəndə ki, "Əlbəttə, səni", başını bulayıb anamı qınamışdı: "Məndən o qatarda, Allah bilir, neçəsi var, bu qərarı necə verə bilərsən?". Bax, onda ona deməsəm də, bir daha əmin olmuşdum ki, məndən çox-çox böyükdür. Böyüklüyünü görür və qibtə edirdim.

Aradan illər keçib və mən ilk kitabımı çap edirəm. Bu kitabı da məhz ona həsr edirəm. İstəyirəm bunu oxuyan sən də mənim nə qədər ümidli olduğumu, hər şeyin yaxşı olacağına, işıqlı günlərin gələcəyinə nə qədər inandığımı bütün varlığınla hiss edəsən. Bəlkə də, biz heç vaxt səninlə üz-üzə gəlməyəcəyik və ya əksinə, haçansa qaranlığın olmadığı yerdə görüşəcəyik, sonra necə olacağından asılı olmayaraq, indilik mənimlə sadəcə bu şəkildə bir tanışlıqla kifayətlən.

İnan, sev və daim oxu, araşdır. Amma ən əsas məsələ inanmaqdır. Bu inam adlanan şeyin sayəsində insanlar təkbaşına orduların qarşısında dayanır, təkbaşına vətənini müdafiə edir, bütün dünya ondan hərəkət etməsini tələb edəndə yerində bir qaya kimi dayanır və gözlərinin içinə baxaraq: "heç yerə tərpənmirəm!" deyir. İnanırsansa, məğlubedilməzsən. Güclü dişlərə, yırtıcı instinktlərinə, psixoloji işgəncələrə qarşı ən böyük silahın da daxilindəki inamındır.

Əlindəki bütün imkanları aldıqda təbiət qarşısında ən çarəsiz varlıq olduğunu da unutma. Daxilindəki inamı qoru, səni sən edən, əslində, odur.

Qələbə sadəcə inamdır.

*Rayonda yaşayanda axşamlar eyvana çıxıb ulduzları seyr etməyi sevirdim. Bu proses bəzən gecəyarısına kimi davam edirdi. Hətta anam da çox vaxt əlindəki işlərini bitirib bizə qoşulurdu. Deyirdi ki, hərənin bir ulduzu var. Haçan biri düşürsə, deməli, onun yerdəki təmsilçisi haqqın rəhmətinə qovuşub. Həvəslənib hərəmiz bir ulduz seçmişdik və özümüzü inandırmışdıq ki, o ulduz bizim enerjimizdir. Böyüyəndən sonra bu vərdişi yadırğadım. Çünki köçdüyüm meqapolisin səmasında ulduz görünmürdü. Üstəlik daha bu səfsətəyə inanmırdım. Arabir anamın dediklərini xatırlayıb gülümsəyirəm. Hətta mənə elə gəlir ki, bu, ölkənin hər yerində belədir. Hamımızın ulduzu sönüb. Artıq səmada ulduz yoxdur...*

***2023.01.26, Bakı***

*Çoxdandır, ulduzlu gecə görmürdüm. Uşaqlıq illərimi xatırlatdı. Əməllicə ümidimi itirmişdim. Az qala özümü inandırmışdım ki, ölkənin hər yerində belədir, yəni ulduzlar ərşə çəkilib və səma sadəcə qaranlıq boşluqdan ibarətdir. Bu gün isə yanıldığımın şahidi oldum. Ulduzlar yoxa çıxmayıb. Hələ də sayrışır, yanıb-sönür. Onları görə bilmək üçün əziyyət çəkib başını yuxarı qaldırmalısan. Vəssalam.*

***2024.04.15, Kürdəmir***

*Mərhum qardaşım*
*Rizvan Tağıyevin ruhuna ithaf edirəm.*

Birinci hissə

## ƏRAF

Gün qüruba doğru əyilir, əyildikcə də kölgələr uzanırdı. Son şüaların pəncərədən süzülərək divara düşən boğuq narıncı əksinin sərhədləri isə yavaş-yavaş tavana tərəf sürünməkdə idi. Əvvəllər böyük və xoşbəxt bir ailənin yaşadığı mənzilin bir parçası olan bu otaqdakı ölü sükut, cansıxıcı yeknəsəqlik məzarlığı andırırdı. O biri otaqların da bəziləri möhürlənmiş, ikisi isə kirayə verilmişdi.

Dəmir çarpayıda tərsinə, üzü üstə uzanan bir gəncin arıq, çiyninin sümükləri çıxmış sısqa vücudu istisna, kiçik pəncərəsi olan bu dar, rütubətli və səliqəsiz otaqda başqa həyat nişanəsi yox idi.

Kənardan baxan olsaydı, üst-başı çirk içində, süst qalmış bu adamı yəqin ölmüş sanardı.

Çarpayının yanında içi kitabla dolu iri rəf, baş hissəsində isə divardan asılmış böyük şəkil vardı. Orada şəstlə yan-yana dayanan iki cüssəli və eynəkli gənc oğlan ona baxırdı.

Hüseyn tərpənməsə də, sağ idi və digərlərindən heç nə ilə fərqlənməyən bu gecəni də beləcə yola verməkdə idi. Bayırda isə şəhər qaynayırdı: maşınların yeknəsəq siqnalı, yüzlərlə, minlərlə, müxtəlif məqsədlərlə o üz-bu üzə qaçışan, harasa tələsən insan səsləri, axşam küləyinin şüşəsi sınıq pəncərədən gələn həzin səsi... İçindəki səngimək bilməyən, zaman-zaman ara versə də, güc toplayıb yenidən hücuma keçən fırtınalar o qədər dağıdıcı idi ki, zəif vücudunu müqavimətsiz hala gətirmişdi. Şər qarışdıqdan sonra nəhayət özündə hey tapıb başını dikəltdi. Çarpayıdan vurtut bir metr kənarda, bir qıçı şikəst balaca stulun üstündəki uzunsov şüşə qaba və iynəyə baxanda qolu biixtiyar o tərəfə uzandı. Gözləri təsadüfən divardakı rəsmə sataşanda yenə ixtiyarsız özünü yığışdırdı və əlini ehmalca geri çəkdi. Öncələr də belə olurdu, amma əksərən bu hərəkətsiz baxışlara məhəl qoymayıb ağlında olanı edirdi. Bu dəfə nədənsə o baxışlara tabe oldu və qıvrılıb ağlamağa başladı.

“Gördün?! Mən dediyim oldu, ya yox?!”

İlk vaxtlarda bu səsi eşidəndə dik atılar, içindən bir hayqırtı keçərdi. Amma daha öyrəşmişdi, gücünü göz yaşlarına verirdi.

“Sənə demişdim axı! Eşitmədin məni. İndi əlini çəkməyin heç nəyi dəyişmir. Gecdir, çox gecdir!”

Qəfil cismində qəribə canlanma hiss etdi, canındakı yorğunluq sanki onunla yoxa çıxdı. Nağara çubuqlarına bənzəyən nazik qolları üstə dikəlib çöldən gələn səslərə qulaq kəsildi. Alışdığı qarışıq səslər axşama doğru daha da gurlaşmışdı.

Boynunu güclə tərpədib nəzərlərini divardakı rəsmə yönəltdi, oradakı iki gənclə bir neçə saniyə baxışıb gülümsündü və qəfil ağlına gələn fikrin təsiri altında qalxıb şalvarını geyindi, nimdaş paltosunu çiyninə keçirib şərfini boğazına doladı və otağı tərk etdi.

***

Binanın həyətinə yenicə düşmüşdü ki, kimsə arxadan fit verib onu çağırdı. Saçı çal, üz-gözünü tük basmış, yamaq-yamaq olmuş hərbi geyimli və bir ayağı protez olan bu adamı buralarda ilk dəfə idi görürdü. Yad adam əlindəki əsaya söykənib gözünü Hüseynə zilləmişdi.

- Mamaoğlu, bəlkə, üstündə beş köpüyün ola?

Qaşını çatıb önündəki adamı başdan-ayağa yenidən süzdü, ani duruxmadan sonra cavab verdi:

- Yox, yoxumdu. Neynirsən beş qəpiyi?

Hərbi geyimli adam qəfildən ağlamağa başladı, amma az çəkdi, tez də özünü yığışdırıb boğazını arıtdı və ciddi səslə:

- Kibrit alacam, - dedi.

Hüseyn əlini cibinə salıb bir manat çıxardı.

- Al, qalığı qalsın.

Yad adam pulu alıb cibinə qoydu, çevrilib getmək istəyəndə nə fikirləşdisə, ayaq saxladı, qəfil qollarını açıb səndələyə-səndələyə ona tərəf addım atanda geri çəkilib arxaya baxmadan yeyin addımlarla oradan uzaqlaşdı…

Şəhərdə qəribə bir harmoniya vardı: elektrik cərəyanının keçdiyi naqilə bənzəyən, maşınla qaynayan küçələr və bu küçələrlə o tərəf-bu tərəfə fikirli halda, tələsik addımlarla qaçan, harasa tələsən, sanki bu naqildəki mənfi və müsbət ionları xatırladan insanlar, bir-birinə qarışmış səslər, iliyə qədər işləyən amansız şaxta. Bir də, küçə sənətçiləri və dilənçilər. İstedaddan yarımadığı kimi, taledən də yarımamış bu küçə sənətçilərinin, məhrumiyyətlərin vaxtsız qocaltdığı, ehtiyac və xəstəliyin küçələrə saldığı ağbirçək və ağsaqqalların, əlindən hər iş gələ də, ucuz iş təklifinə möhtac cavanların hərəsinin bir hekayəsi, tarixçəsi var. Kimsə kefdən bu küçələrə düşməz yəqin. Düşündü ki, atasından qalan balaca, baxımsız otaq olmasaydı, bəlkə o da indi burada, onlarla yanaşı bardaş qurmuşdu.

İnanmırdı ki, buradakılardan kimsənin taleyi onunkuna bənzəsin. Vaxt vardı, onda olan var-dövlətin, imkanların burada kimdəsə olmadığına əmin idi. Dahi yazarlardan birinin sözlərini xatırladı: xoşbəxt insanlar bir-birinə bənzəyir, bədbəxtlər hərəsi bir cür bədbəxtdir. Həyatın ancaq gülər üzünü görmüş, ömründə bircə gecəsini küçədə keçirməyənlər onları çətin anlaya. Necə ki, vaxtı ilə onun da ağlına belə şeylər gəlmirdi və eyni həyatı yaşamalı olacağı heç xəyalından da keçmirdi …

Kədər, donuq ifadəli və ümidsiz baxışlarla ətrafa bir də göz gəzdirib siqaretini yandırdı, ortasına çatmadan atıb yaxınlıqdakı paba tərəf istiqamət aldı.

Pabda siqaret və pivə qoxusundan dayanmaq olmurdu. İçərilərə doğru getdikcə hava da ağırlaşır, bu qoxulara qusuntu iyi də qarışırdı. Haradansa səsucaldana qoşulmuş türk rokunun qulaqdeşici səsi, rus və türk dillərini qarışığından yaranan qəribə aksentlə qışqıra-qışqıra danışan gənclər, bu əndrəbadi söhbətləri müşahidə edən söyüşlər, domino daşlarının yeknəsək takkıltısı, tüstü və qəhqəhə səsləri… Kimsənin az öncə qusduğu üfunət qoxusu verən maye qarışığı da ortalıqda qalmaqda idi və görünən o idi ki, kimsə bundan narahat olmurdu. Küncdə iki nəfər gənc qız "peredoz" halında idi. Onların yaxınında başqa iki nəfər bir-birilərinə ötürdükləri şprisdəki ağ mayeni ciddi-cəhdlə damara ötürürdülər. Paytaxtda bu tip pabların fəaliyyətinə yol verilməsə də, bu obyektə dəyib-dolaşan yox idi. Şayiə gəzirdi ki, yiyəsinin dövlət orqanlarının birində yüksək rütbəli zabit tanışı var, gəlirin bir qismi ona çatdırılır.

Hüseyn əyləşib pivə sifariş etdi. İçəri girəndən bəri qalın qaşları altında itmiş xırda gözləri ilə onu müşahidə edən tösmərək kişi qollarını çırmalayıb ona tərəf addımladı.

- Üzünü görək, paşam, nətərsən?

Hüseyn ona sarı uzanan balaca, kündəyə oxşayan əli havadan asılı saxlasa da, kişi tövrünü pozmadan üzbəüz stulda əyləşdi:

- Nolub ala, kefin yoxdu? Pul dərdi eləmə, sən yaxşı qardaşsan, gözləyərik. Onu düzəlt ver, qaqan sənə təzə mal gətizdirsin. Balamın əziz canı, elə mal ki, tayı-bərabəri yoxdur!.. Nə deyibsən?

- Pivə, – Hüseyn siqaretini çıxarıb yandırdı.

- Ay qız, ordan iki bakal gətir! – Kişi də döş cibindən birini çıxarıb yandırdı. – De görüm haralardasan e?

- Evdə, harada olacam? İş var ki? Axşama kimi üzü üstə uzanıb yatıram, – Hüseyn kişinin sualına candərdi cavab versə də, ona tərəf baxmırdı.

Amma həmsöhbəti onun ünsiyyətdən qaçmaq cəhdlərini görməzdən gəldi:

- Ala, heç olmasa yemək ye, ikilik taxtaya dönübsən, – canı yanırmış kimi üzünü turşutdu, – gəl də bura. Danışaram müəllimlə, alınsa, şey eləyərik səni. Neyləyəssən e evdə uzanıb?

- Yox e, Murad, çox sağ ol, istəmirəm.

- Ədə, yekə oğlansan, nə naz eləyirsən? Eşit də məni. Müəllimin rəislərlə arası sazdır, özü də çörək verən kişidir… – Bu yerdə zorən həmsöhbətinə göz vurub qımışdı, başı ilə pivə gətirən qızı göstərib davam etdi: – Darıxmazsan burada, Nata qoymaz.

Qız pivəni gətirib stolun üstünə qoyanda Murad üzünü ona tutdu:

- Elə deyil, Nata?

Qız gülümsəyib nəsə mızıldandı. Hündürboylu və əndamlı olsa da, Hüseynə elə gəldi ki, onun heç on səkkiz yaşı olmaz. Yaşaya bilmədiyi uşaqlıq illərinin izləri üzündən çəkilməmiş qızın baxışlarının dərinliyində gizləməyə çalışdığı kədər də gözündən yayınmadı. Nata bakalları qoyub uzaqlaşmaq istəyəndə Murad onun arxasına yüngülcə şillə çəkdi. Görünür, buna artıq öyrəşmiş qız heç nə olmamış kimi onlardan aralananda Murad gözlərini qızın, yeridikcə o tərəf bu tərəfə əyilən arxasından çəkmədən pivədən iki-üç qurtum alıb çoxmənalı şəkildə dili ilə dodaqlarını yaladı və yenidən həmsöhbətinə çevrilib daha bir siqaret yandırdı:

- Hələ ki tər bənövşədir. Nə qədər ki solmayıb, o boyda rəisləri, nəçəlnikləri qabağında diz çökdürüb həm özü şellənəcək, həm də bizi şelləndirəcək…

- Neçədir yaşı? – Hüseyn bu dəfə baxışlarını Muradın gözlərinin içinə zillədi.

Sualdakı və baxışlardakı ikrah hissini sezsə də, Murad özünü o yerə qoymadı:

- Nə bilim ala, məktəbdə oxuyurdu, yetimdi. Amma canıyanmışın bəxti it bəxtidir! Burada deyiblər e, göt ol, bəxtin olsun, – əlini əlinə vurub şaqqanaq çəkdi, amma Hüseynin sifətindəki ciddiliyi görüb tez də özünü yığışdırdı.

- Necə yəni?

- Nətər e necə yəni?! Demədimmi, ala, bayaq?! Rəis həftədə bir dəfə adamlarını yollayıb qızı mindirir qara CİP-ə, gətizdirir hüzuruna. Səhər də eyni qaydada gətirib qoyur bura. Pulu, son model ayfonu, qır-qızılı, rəisin göstərdiyi qayğı və sevgi… Day bundan artıq nə istəməlidi ki?

- Uşaqdı e o! – Hüseyn sözünü ağzında qoydu.

- Olsun da uşaq! Qəhbənin nə uşağı, nə böyüyü?! Həm də, sənə nə düşüb? Alan razı, verən razı. Ağıllı çıxıb mənim üçün! – Cavabı eyni tonda verən Murad qalxıb bufetə tərəf yol aldı, kimsəyə acıq verirmiş kimi, yolüstü qızın arxasına daha bir yüngülcə şillə çəkdi.

İçəridəki havanın ağırlığındanmı, ya da indicə gördüklərindən və eşitdiklərindənmi Hüseynin başı ağrımağa başlamışdı. Pivənin pulunu stolun üstünə qoyub pabdan çıxdı.

Bir neçə addım uzaqlaşmışdı ki, yanından qara CİP ötdü və düz pabın qabağında saxladı. Hüseyn bayaqkı söhbəti xatırlayıb ayaq saxladı, özünü kənar yerə verib izləməyə başladı. Maşından iki cüssəli kişi düşdü, biri maşının yanında dayandı, o biri isə paba daxil oldu. Az keçmiş, içəridən qıy qopdu. Bir əli ilə Natanın saçını, o biri ilə ağzını tutmağa çalışan Murad və arxadan onları müşayiət edən cüssəli kişi görünən kimi, bayaqdan telefonla danışan o birisi maşına mindi və müqavimət göstərməkdə davam edən qızı güc-bəla ilə içəri soxandan sonra sonra maşın işə düşdü…

***

Artıq bir neçə döngə geridə qalmışdı. Yavaş-yavaş nəfəsi daralıb qulaqları cingildəməyə başlasa da, dayanmadı, divarları tuta-tuta, səndələyə-səndələyə irəliləməyə davam etdi. Hiss edirdi ki, gözləri qaranlıq gətirir. Şüuru iflic olmuşdu, nə istədiyini düşünməyə gücü qalmamışdı.

Binanın həyətinə burulan küçəyə dönəndə səs-küy və havadakı pis qoxulu tüstü bir çox funksiyaları sıradan çıxmaqda olan zəif vücuduna vicvicə saldı. Son dəfə gücünü toplayıb addımlarını yeyinlədərək həyətə daxil oldu və ani təkana bənd zəif ayaqlarının keyiməkdə olduğunu hiss etdi. Bayaqkı hərbi geyimli, şikəst adamın ondan pul istədiyi yerdən bir neçə metr kənarda izdiham vardı. İnsanlar tonqalın ətrafına toplaşmışdılar, amma bu adi tonqal deyildi – yanan insan bədəni idi. Başqa vaxt olsaydı, dayanıb tamaşa edərdi, ətrafdan nə baş verdiyi ilə maraqlanardı. Amma indi o hayda deyildi.

İzdihamdan yan ötüb binaya daxil olmaq istəyəndə gözünə yerə atılmış əsa sataşdı. Başını bulayıb bloka keçdi.

***

Gün məşriqdən qalxır, qalxdıqca da kölgələr qısalırdı. İlk şüaların pəncərədən süzülərək divara düşən narıncı əksinin sərhədləri isə yavaş-yavaş genişlənməkdə idi. Amma artıq bu otaq ona məzarlıq kimi görünmürdü. Əksinə, indi daha canlı, daha rəngli idi.

Rəfdəki kitablar cansız olsa da, bayırdakı insanlardan daha doğma idi ona. O kitablar Hüseynə köhnə zamanlardan, azad və firavan günlərdən bəhs edirdi. Çarpayının baş hissəsində divardan asılmış böyük şəkildəki cüssəli, eynəkli və sifətlərində təbəssüm donan iki gəncin ona zillənən baxışları sanki nəsə çatdırmaq istəyirdi.

***

Müstəntiqin bağıraraq qarşı tərəfin ünvanına yağdırdığı rabitəsiz söyüşləri, onları müşayiət edən guppultu səslərini və arabir gələn zəif iniltini dindirmə otağının yerləşdiyi yarıqaranlıq dəhlizdə var-gəl edən növbətçidən başqa kimsə eşitmirdi. Bir saat öncə dindirilmə üçün gətirilmiş çəlimsiz, üzündən mağmınlıq yağan gəncin halına növbətçi acımağa başlamışdı. Nəyin üstündə tutulduğunu bilməsə də, intusiyası ona, bu gəncin müstəntiqi çilədən çıxaracaq hər hansı cinayət törətmədiyini pıçıldayırdı. Amma "Yaxşı at özünə qamçı vurdurmaz" deyib bu fikirləri tez də özündən uzaqlaşdırdı. "Yəqin ki, bir zibil işi var, yoxsa Rəhimov bu qədər əsəbiləşməzdi" – deyə düşündü…

- Qızı haradan tanıyırdın?

- Başına dönüm, ay rəis, dədəmin goru, tanımıram, Allaha and olsun, tanımıram...

Qəfil sağ qulağına endirilən şillə sözünü yarımçıq qoydu. Batdığını hiss etdiyi qulağını əli ilə ovuşdurub zarıdı.

- Ə küçük, məzələnirsən mənimlə?! Deyəsən, hələ sənə çatmır ki, nə böyük pox yemisən?! Sənin o dilini yerindən qopardaram! Davay, de görüm, niyə öldürdün onu?

Gəncin rəngi ağardı. Təxmini iki-üç saniyə vəhşət içində, ağzı açılmış halda müstəntiqə baxdı və bütün gücünü toplayıb dili topuq vura-vura:

- Mən etməmişəm, anamın canı xəbərim yoxdur, məni çevir balalarının başına, qurban olum, yetim uşağam… - deyə bildi.

- Ə, gözümün on beşi aydın yetimsən! Bu dəqiqə yollayacam səni də dədənin yanına, axmağın biri axmaq! - Gəncin saçından tutub sürüyə-sürüyə otağın o biri başına gətirdi; ortalıqda su dolu yekə bir qab var idi: - Boynuna alırsan, ya yox?

- Rəis, vallah, billah, mən etməmi….

Sözünü bitirməyə imkan tapmamış güclü bir əl boynunun arxasından yapışıb başını suya salıb, bir neçə saniyə sonra çıxardı:

- De görüm, niyə öldürdün o qızı?

- Rəis, anamın o əziz canı…

Yenə sözü ağzında qaldı, boynundan yapışan əl başını yenidən suyun içinə soxanda bu dəfə az qala boğulacaqdı.

- Düzünü deyəssən, ya yox?!

- Öldür məni, qurban olum, bezmişəm canımdan…

- Ə, düdük, oyun oynama mənimlə! Sən öləsən, başına elə oyun açaram ki, ölməkdən betər hala düşərsən!

Rəhimovun əlini çəkməyi ilə sir-sifəti su içində olan adam tirtap yerə sərilməyi bir oldu və elə o haldaca için-için ağlamağa başladı.

Bir neçə saniyə sürən səssizlik qapının arxasındakı növbətçiyə bir saat kimi göründü. Əvvəlki qəzəbli söyüşlər yox idi deyə, zəif hıçqırıq səsləri daha aydın eşidilirdi.

Çox çəkmədi, müstəntiqin səsi yenə otağı bürüdü:

- Madam ki, adam dilini anlamırsan, məcburam səninlə başqa dildə danışım!

Elektroşoku gəncin boynuna yaxınlaşdırınca, güclü elektrik axınının təsirindən gənc yerindən tapanca kimi atılıb döşəməyə çırpıldı, bir-iki zəif tərpənişdən sonra sərildiyi yerdə süst qaldı. Rəhimov əvvəl buna məhəl qoymadı, elektroşoku yenidən həmin nahiyəyə yaxınlaşdırdı. Öncəki reaksiyanı görməyincə bir az rahatsız oldu. Əyilib gəncin üzünə şapalaq ilişdirdi. Reaksiya yox idi. Əlini biləyinə aparıb iki-üç saniyə saxladıqdan sonra geri çəkdi, qaşlarını düyünləyib dodağının altında nəsə mızıldadı, ayağa qalxdı və masaya yaxınlaşdı. Oradakı protokola tez-tələsik bir neçə cümlə yazıb imzalayandan sonra yerdə hərəkətsiz uzanmış vücuda etinasız nəzər salıb otağı tərk etdi.

Bir neçə saat sonra xəbər saytları ölkədə səs-küy doğuran qətldə günahkar bilinən Hüseyn Süleymanovun dindirmə zamanı qəfildən ürək tutmasından vəfat etməsi barədə DİN-in açıqlamasını tirajlayırdı…

***

Gecə evə gələndə başı az qala partlamaq həddində idi. Səssizcə özünü divana verdi. Hamı yatmışdı, otağın sükutunu yalnız divardakı kəfkirli saatın çıqqıltısı pozurdu. Dözülməz həddə çatan başağrısının yatmaqla keçməyəcəyini düşündü. Səhər tezdən də işə getməli idi. Birtəhər ayağa qalxıb soyuducudan parasetamol götürdü, su ilə ötürüb yenidən divana uzandı. Saata gözucu nəzər saldı: 23.45 idi. Bu dəfə də uşaqlarını oyaq yaxalaya bilmədiyi üçün heyifsiləndi: neçə gün idi görmədiyi övladları üçün çox darıxmışdı. İki günə məzuniyyətə çıxacaqdı, onları doyunca üzlərini görə biləcəyində rahatlıq tapıb az sonra yuxuya getdi…

Qapının aramsız zənginə oyananda saat 23.50-i göstərirdi. Təəccübləndi: cəmi beş dəqiqə idi yatdığı? Amma daha qəribə gələni qulaq deşən zəngə yataq otağından reaksiyanın olmaması idi: oradan hənirti belə gəlmirdi. Zəng təkrarlanmasın deyə tez özünü qapıya yetirib gözlükdən boylandı. Kimsə gözə dəymirdi. Duruxdu, geri qayıtmaq istədi, amma bir-iki addım geri atmışdı ki, ayaq saxladı. Zəngin yenidən çalına biləcəyi ehtimalı qalırdı; bir az gözləməyə qərar verdi. Az keçmiş, zəng yenə çalındı və bu dəfə gözlüyə baxmadan qapını açdı. Keçisaqqal, başında qəribə papaq, başdan-ayağa qırmızı geyinmiş ortaboylu adam sırtıq gülümsəmə ilə üzünə baxırdı. Bir saniyədən azca çox baxışdılar. Kişinin görkəmində, bu vəziyyətdə belə, ona çox gülməli görünən nəsə vardı. Amma baş yormadı, üzünə sərt ifadə verdi:

- Kimsən? Nolub gecənin bu vaxtı?

Qarşısındakı gülünc görkəmli adam utancaq görkəm alıb əlini cibinə ataraq bir zərf çıxardı, onu Rəhimova uzatdı:

- Bu sizə çatacaq, Rəhim bəy… Mənə görə ayrı qulluğunuz?

Rəhim bir zərfə, bir kişiyə baxdı, sualı cavabsız qoyub zərfi aldı və qapını kişinin üzünə çırpdı. "Görəsən, xeyirdi?" düşüncəsi ilə tez zərfi açdı. Orada bir cümlə yazılmışdı:

"Hörmətli Rəhim bəy, saat 00.00-da baş tutacaq tədbirimizə dəvətlisiniz!"

Saata baxdı, 23:55-i göstərirdi: tədbirə cəmi beş dəqiqə qalırdı. Nə tədbirdi bu? Mövzusu nədir? Kim edir? Harada olacaq? Dəvətnaməni bu vaxt niyə gətiriblər? Beynində suallar bir-birinə qarışmışdı.

Baş verənlər müəmmalı gəldi, narahat olmağa başladı. Əvvəlcə istədi az öncə əynindən çıxardığı formadan silahını götürüb zərfi vermiş kişinin dalınca qaçsın, amma tez də fikrindən daşındı. Səhər tezdən işə getməli idi, hər yoldan keçənə görə niyə yuxusundan olmalı idi?

Zərfi bir kənara tullayıb yenidən divana uzanan anda qapı zəngi yenidən çalındı. Bu dəfə divandan atılıb tez silahını qapdı, yeyin addımlarla qapını açıb silahı qaldırmışdı ki, qolu boşaldı. Ayaqlarının da qolları kimi öz funksiyasını itirməyə başladığını hiss etdi. Bayaqkı kişi yenə sırtıqcasına gülümsəyirdi, amma bu dəfə sağında və solunda bir nəfər vardı. Bəlkə də, həmin adamlar tanımadığı, tamam yad adamlar olsaydı, reaksiyası fərqli olardı. Onu bir anın içində büküb yumağa çevirən, qarşısındakı adamların onun özü olması idi.

Hər ikisi qoluna girib onu otaqdan çıxaranda müqavimət göstərmədi. Sürüyə-sürüyə aparıb binanın qabağında dayanmış qara maşına oturtdular. Sürücüsüz maşının işə düşməyi ilə dayanmağı bir oldu. Maşından düşürdüb indiyə kimi şəhərdə heç rast gəlmədiyi binanın işıqlı girişindən içəri keçirdilər. Hər şey o qədər sürətlə baş verdi ki, bir də gözünü açıb özünü adamla ağzına qədər dolu zalda gördü. Orada anlaşılmaz və paranormal görünən bir çox şey vardı; həmin anda keyimiş şüuru gördüklərini alqılamaq, məntiqli izahını vermək iqtidarında deyildi.

Zal o qədər böyük idi ki, o başı görünmürdü, yalnız ortada ucalan tribuna aydın nəzərə çarpırdı. Ən yaxındakı divarda əqrəbləri 23.59-u göstərən iri kəfkirli saat asılmışdı – bu onun otağındakı saat idi. Onu ən çox ürküdən şey isə zalda bu qədər adam olmasına rəğmən, dərin sükutun hökm sürməsi və hamının yerdə bardaş qurması idi. Ətrafda tanış sima gözünə dəymirdi. Yanındakı əkizləri də yoxa çıxmışdı. Hamının gözü tribunada idi. Hələ ki, ora boş idi. Saat 00.00-ı vuranda bayaq qapısına gəlmiş gülünc görkəmli adam hakim cübbəsində tribunaya qalxdı. Ayağını tribunaya qoyması ilə ayağa duran zaldakılar, onun əl işarəsi ilə yenidən oturdular.

- Əziz xanımlar və cənablar, – zaldakılara gözucu nəzər salıb davam etdi, – hər birinizi burada görməyə çox şadam və ümid edirəm ki, eynilə siz də şadsınız!

Əvvəlcə zaldan səs çıxmadı, sonra bir az uzaqdan kimsə qalxıb əsəbi şəkildə nəsə dedi və iki nəfər qoluna girib zaldan çıxardı. Hakim buna məhəl qoymurmuş kimi, nitqinə davam etdi:

- Bu gecə bizim xüsusi qonaqlarımız var. Çox uzatmadan, istərdim birincisini dəvət edək! Cənab Zamiq Quliyev!

Orta sıralardan cüssəli bir nəfər ayağa qalxıb tribunaya yaxınlaşdı. Mikrafon verilən kimi, hakim üzünü ona tutdu:

- Zamiq bəy, burada sizi çoxu tanımasa da, biz çox gözəl tanıyırıq…

- Məni niyə bura gətirmisiniz? Siz kimsiniz?

- Sakitləşin, bizim pis bir niyyətimiz qətiyyən yoxdur. Sadəcə, sizə bir neçə sual verəcəyik və ümid edirəm ki, onlara cavablarınız buradakı hər kəsə maraqlıdır.

Zaldan səs çıxmadı. Hakim sözünə davam etdi:

- Fəaliyyətinizə yaxından bələdik. Dostlarımız, – əli ilə kənarda duran iki nəfəri göstərəndə Rəhim ürəyində şükür etdi ki, Zamiq deyə təqdim olunan adam dönüb onlara baxmadı, yoxsa heç də sakit reaksiya verməyəcəkdi, – sağ olsunlar, mütəmadi bu barədə bizə məruzə edirdilər. Öncə, altı il əvvəlki Tərtər hadisələrindən başlamaq istərdik…

Zamiqin rəngi ağardı, bir neçə addım geri atdı, həyəcandan mikrafonu əlindən saldığı üçün, dediklərini zal eşitmədi.

- Olan şeydir, - hakim ona təsəlli verirmiş kimi gülümsünüb, üzünü zala tutdu, Zamiq bəy, həmin vaxtdan xatirinizdə daha çox nələr qalıb?

Zamiq şərab badəsində verilmiş suyu başına çəkib gözünü ovuşdurdu, sonra üzünü zala tutub çətin eşidiləcək tonda nəsə dedi.

- Lütfən mikrafonu dostumuza verin… Buyurun, Zamiq bəy, eşidirik sizi…

- Mənim heç bir günahım yoxdur. Əmr gəlmişdi, onu icra etməli idik. Həm də ki… – Duruxdu, bir neçə saniyəlik fasilədən sonra səsini qaldırdı: – Onlar vətənə xəyanət etmişdilər!

- İşgəncə ilə öldürdüyünüz Şamil Quluzadə vətənə xəyanət etmişdi?

- Mən onu öldürməmişəm! Onun… onun ürəyi xəstə idi. Dindirmə zamanı qəfildən tutdu. Qaldı ki… Hə, o da vətənə xəyanət etmişdi!

- Sübutunuz vardımı?

Zamiq qolu ilə alnının tərini sildi:

- O, dirəndi, etiraf etmək istəmədi. Etsəydi, sağ qalacaqdı.

- Sualım konkretdir: xəyanəti təsdiqləyən sübutunuz vardımı?

- Ermənilərə məlumat ötürmüşdü. Sübutlar korpus komandirindədir. Olmasaydı, əmri verməzdi!

- Nə barədə idi əmr? Hər şeyi olduğu kimi danışın…

Zamiq susurdu. Narahat baxışları ilə zalı dolaşıb başını aşağı əydi:

- Bizə deyildi ki, ya adları verilən hərbçiləri öldürəcəklər, ya da bizi… ən yaxşı halda ordudan xaric edəcəklər…

Zal qəfildən canlandı. Hakimin əli ilə zala susmaq işarəsindənsanki qurbağa gölünə daş atdılar.

- Lütfən bura gəlin, – hakim bayaqdan kənarda əyləşmiş, əlindəki dəftərə ara-sıra nələrisə qeyd edə-edə səssizcə Zamiqi müşahidə edən birini çağırdı.

Rəhimin canından gizilti keçdi, çağırılan adam Zamiqin eynisi idi. Amma Zamiq yenə o adama tərəf dönmədi.

- Deyilənlərə əlavəniz varmı?

- Bəli, var. Hadisələri canlı olaraq müşahidə edən biri kimi qeyd etməliyəm ki, dediklərində tək doğru şey əmrin korpus komandirindən gəlməsi idi. Ona da əmr baş qərargahdan gəlmişdi. İşdən qovulma hədəsində də haqlıdır, amma öldürülmə ilə hədələnməyib. Gizir Şamil Quluzadənin vətənə xəyanət etməsi ilə bağlı əlində hər hansı sübut, ən xırda təsdiqedici fakt belə olmayıb. Əmr gəldiyi gün Şamili çılpaq soyunduraraq əlini-qolunu bağlayıb, dindirmə aparmadan, səkkiz saata yaxın ona işgəncə verib. Suda boğma, kəsici-deşici alətlərlə göz və qulaq nahiyəsinə xəsarət yetirmə, şallaqla və rezin şlanqla döymə… hər vasitəyə əl atıb. İşgəncənin səkkizinci saatında çəkiclə başına endirdiyi zərbədən sonra Şamil dünyasını dəyişib. Əməlindən nəinki peşmanlıq hissi edib, əksinə, törətdiyi qətl barədə fəxrlə korpus komandirinə məruzə edib.

- Müfəssəl məlumat üçün təşəkkür edirik. – Hakim başı ilə də razılıq etdi. - Hər hansı əlavəniz varmı?

Zamiqin o biri əkizi çiyinlərini çəkib başını buladı.

- Əla, o zaman zəhmət olmasa, bəyi yola salın.

Əkizləri Zamiqin qoluna girib harasa apardılar.

Hakim onların arxasınca belə baxmadan əlinin altındakı siyahını gözdən keçirdi.

- Cənab Faiq Əliyev, lütfən tribunaya qalxın…

Rəhim bu adı çox eşitmişdi. Faiq Əliyev… Bu yaxınlarda dünyasını dəyişmiş hakimin sədrlik etdiyi proseslər əsasən siyasi motivli işlərlə bağlı idi, hətta bir neçə prosesdə Rəhim özü də şəxsən iştirak etmişdi. Yox, o olmaz, axı o, keçən il dünyasını dəyişib, - deyə düşündü, - yəqin söhbət eyni ad-soyadda başqa birindən gedir.

Çağırılan şəxs ağır addımlarla tribunaya qalxdı. Rəhim əvvəl gözlərinə inanmadı. Əlləri ilə gözünü qızarana kimi ovuşdurub yenidən qıydı; tribunada dayanmış şəxs məhz tanıdığı Faiq idi…

- Faiq bəy, vaxtımız məhdud olduğu üçün birbaşa mətləbə keçəcəyik. Bu gəncləri xatırlayırsınız?

Hakimin uzatdığı kağızdakı şəkli zalda oturanlar görmədi, amma orada kimlər vardısa, zəif görən gözlərini qıyıb şəklə dikən Faiqin əhvalının pozulduğu aydın gözə çarpırdı.

- Hə, tanıyıram.

- Onların həqiqətənmi, narkotik vasitə aludəçiləri və alverçiləri, qanqster olduqlarına inanırdınız?

- Bəli, evlərindən narkotik vasitələr, partlayıcı maddələr və silah-sursat tapılmışdı. Hələ çalışmışdım, az verim. Gənc idilər, yazığım gəlirdi…

- Deməli, qərar verərkən öz daxili inamınıza əsaslanmış və heç bir yerdən göstəriş almamışdınız, eləmi?

- Əlbəttə! Hardansa  göstəriş ola da bilməzdi...

- Həmin gənclər həm də siyasi fəaliyyətlə məşğul idilər, verdiyiniz qərara bunun heçmi təsiri olmamışdı? Həm də bəziləri əfv edildikdən sonra həbsdən əvvəlki siyasi fəaliyyətlərinə görə peşman olduqlarını bəyan etmişdilər.

- Cənab hakim, onların bu fəaliyyətləri cəmiyyət üçün zərərli olsaydı, uyğun maddələr üzrə qərar verərdim. Demək ki, bu fəaliyyətlərinin məsələyə aidiyyatı yox idi.

- Sizin bir əlavəniz varmı?

Hakimin sualı Faiqin tam eynisi olan iki nəfərə ünvanlanmışdı. Onlardan biri ağ, o biri qara geyimdə idi. Ağ geyimdə olan başını buladı, qara geyimdəki isə əlindəki dəftərdə sonuncu qeydini edib mikrafonu aldı:

- Cənab hakim, qərar siyasi sifariş əsasında verilmişdi. Həmin gənclərin heç biri qanqster, narkotik maddə aludəçisi və ya alverçisi deyildi, bunu Faiq də çox gözəl bilirdi. Sifarişdə hər birinə yeddi ildən yuxarı azadlıqdan məhrumetmə tələb olunurdu; qərarı verərkən də heç bir şəxsi mülahizəyə əsaslanmayıb. Hətta sifarişi verənlərin xoşuna gəlmək və müəyyən imtiyazlar əldə etmək üçün dörd nəfərə ona deyiləndən bir il də artıq verib.

- Təşəkkür edirəm sizə də. Lütfən bəyi də yola salın.

Həmin iki nəfər Faiqin qollarına girib Zamiqin aparıldığı istiqamətə yollandılar.

Onu saymazyana nəzərləri ilə bir neçə saniyə müşayiət edən hakim başını bulayıb yenidən siyahını əlinə aldı:

- Cənab Sabir Məmmədov, zəhmət olmasa, tribunaya qalxın.

Dolu bədənli, yaşlı kişi yavaş addımlarla tribunaya qalxıb mikrafonu aldı.

- Sabir bəy, suallarımız konkret olacaq, istərdik, konkret və səmimi də cavab alaq. Mən adınızda olan korrupsiya əməllərindən, sahib olduğunuz restoran və şirkətlərdəki qanunsuzluq və əmək istismarı hallarından xəbərdar olduğunuz halda, buna qarşı tədbir görməməyinizdən, sizə tapşırılmış böyük yollar və tunellərin tikinti layihələrindən külli miqdarda pullar mənimsəməyinizdən sual verməyəcəyəm, bu faktlar bizə onsuz da məlumdur, boşuna vaxt itirməyə dəyməz… - Qarşısındakı adam sadalanan əməlləri o törətməyibmiş kimi sakitcə başı ilə təsdiqlədikdən sonra hakim sözünə davam etdi. - Odur ki, bunları bir kənara qoyuruq… Sabir bəy, altı il əvvəl sizin göstərişiniz əsasında sahibkar Ceyhun Gülalıyevin malikanəsi yandırıldı. Mediada yanğının qısaqapanma nəticəsində baş verməsi qeyd olunsa da, hüquq-mühafizə orqanları və biz gözəl bilirik ki, bu, sizin sifarişiniz idi. Ceyhun bəy sizə qarşı hansı bağışlanmaz səhvi etmişdi?

- O məni şantaj və təhdid edirdi. Hətta nəinki məni, oğlumu da tez-tez narahat edib evimizi yandıracağı ilə qorxudurdu. - Sabir təmkinlə cavab verdi.

- Sabir bəy, lazımi şəxslərin bu barədə rəyini alacağıq sözsüz, amma söylədikləriniz mənə inandırıcı görünmədi. Niyə məsələnin hüquqi həlli yolunu seçmədiniz?

- Bunun mənası yox idi. Məsələnin kökündən həll etmək lazım idi.

- Sabir bəy, bizə həmçinin məlumdur ki, Göyçaydakı çınqıl zavodunda fəhlələr gündə on beş saat işlədilir və onlara minimum əmək haqqı miqdarında maaş verilir. Həmçinin bu zavodun ətrafda yaşayan sakinlərə yüz milyonlarla manat ziyan vurduğunu, həm kəndlilərin təsərrüfatını, həm də təbiəti məhv etdiyini və tapşırılmış layihələrin yola verildiyini gözəl bilirik. Buna aktiv etiraz edən kəndlilər isə həbsə atılıblar. Onların günahı nə idi?

- Bunu sizdən eşidirəm, açığı…

- Yaxşı, təşəkkür edirik. – Hakim üzünü yaxınlıqda durub prosesləri izləyən iki nəfərə tutdu: - Sizin əlavəniz varmı?

Ağ paltarlı çiyinlərini çəkdi. Qara paltarlı isə mikrafonu aldı:

- Hörmətli hakim, Ceyhun ona heç bir təhdid və ya şantaj etməyib. Əməlin əsl səbəbi tender zamanı Sabirin ona əməkdaşlıq və şərikli fəaliyyət təklifini rədd etməsi və tenderi udmaq ehtimalının yüksək olması idi. Bu yolla onun başını qatmaq və gözünü qorxutmaq məqsədi güdürdü. Zavodun fəaliyyətindəki qanunsuzluqlar barədə də xəbərdar idi. Buna etiraz edən kəndlilərin susdurulması və digər potensial etirazçıların qorxudulması şəxsən Sabirin əmri idi…

- Təşəkkürlər! Zəhmət olmasa, Sabir bəyi yola salın… Belə-belə işlər… Cənab Rəhim Rəhimov, zəhmət olmasa, tribunaya buyurun…

Rəhimin rəngi ağardı və yerində keyiyib qaldı. Hakim zalda oturanlara nəzər yetirib təkrarladı:

- Cənab Rəhim Rəhimov, burdasınız? Lütfən tribunaya qalxın…

Rəhim ayağa qalxmaq istəsə də, bacarmadı, ayaqları qıc olmuşdu. Amma qıc olan təkcə ayaqları deyildi, bütün bədənini hiss etmirdi, yalnız gözləri görürdü. Qoluna girib tribunaya qaldırdılar.

- Rəhim bəy, birbaşa suala keçək. Bu gün baş vermiş hadisə barədə… Natəvan Sadıqovanın qətlində günahkar bilinən Hüseyn Süleymanovun dindirilməsi sizə tapşırılmışdı. Amma dindirmə zamanı ürəyinin tutması barədə xəbərlər yayıldı. Gəlin, lap əvvəldən başlayaq. Siz də belə düşünürsüz ki, qatil Hüseyn Süleymanov idi?

Rəhim suala cavab verməyə tələsmədi. Gözünün ucu ilə kənarda, əlindəki dəftərə nəsə qeyd edən qara paltarlı əkizinə baxdı. Harada olduğunu tam bilməsə də, düşündü ki, yalan danışmamalıdır, bu, vəziyyətini ağırlaşdıra bilər.

- Yox, onun günahı yox idi…

Zaldakı uğultu dalğası hakimin əl hərəkəti ilə anidən kəsildi.

- Bu protokoldakı qeydlər sizindir?

- Bəli, mənimdir.

- Qeyd edibsiniz ki, günahını etiraf edib və az sonra qəfildən halı pisləşməyə başlayıb. Günahı yox idisə, niyə belə bir qeyd edibsiniz?

- Qatil o deyildi. Heç bir etiraf da etməyib. Əməli törədən şəxsin kimliyi bizə məlum idi, amma qətli kiminsə üstünə atmaq və əsl qatili gizlətmək lazım idi.

- Qətli kim törətmişdi?

- Rayon Polis İdarəsi rəisinin oğlu…

Zal yenə canlandı. Hakim əlinin işarəsi ilə "sakit" komandası verib sözünə davam etdi:

- Onun da atasını dəvət etmişik və ona da suallarımız olacaq. Bizə maraqlı gələn qurban qismində niyə məhz Hüseyn Süleymanovun seçilməsi idi…

Rəhim hiss etdi ki, baş ağrıları yenidən şiddətlənir: suallar işini görürdü.

- Hüseynin nə pulu vardı, nə adamı, yetim uşaq idi. Qərara alındı ki, qətlin onun boynuna qoyulması bizə problem yaratmayacaq. Elə də oldu.

- Həqiqətən, ürəktutmasından öldü?

Rəhim duruxdu. Ürkək nəzərlərlə, yazını dayandırıb ona qulaq kəsilən qara paltarlı əkizinə baxdı.

- Yox, elektroşok… onun təsirindən… Boynu yaş idi, bunu nəzərə almamışdım… səhv mənim idi… Çox üzr istəyirəm, bağışlayın məni, xahiş edirəm… – Əli ilə üzünü tutub hönkür-hönkür ağlamağa başladı.

- Zəhmət olmasa, bəyi də aparın. Təşəkkür edirəm, Rəhim bəy…

Şiddətli ağrıdanmı, ya başına hava gəldiyindənmi, bayaq əkizləri kimi gözünə görünən ağ və qara paltarlıların simasında Rəhim övladlarını gördü, dizləri büküldü, ixtiyarsız yerə çökdü. Qarapaltarlı yaxınlaşıb düz qabağında durdu, başını qaldırıb onun üzünə baxmağa qorxdu. Hönkürərək özünü onun ayaqlarına atanda boşluğa düşdü və pilləkənlə üzü aşağı yuvarlandı. Düşdüyü yerdən qalxmağa taqəti çatmadı, yavaş-yavaş gözlərinin qapandığını da hiss etdi. Ona elə gəlirdi ki, təyyarə yerə enir, amma bu barədə xəbərdarlıq edildiyini xatırlamadı. Bunun çoxdan başlamış və tədricən şiddətlənən başağrısının və yüksək qızdırmanın gətirdiyi hallüsinasiya da ola biləcəyi ağlından keçdi. Başını söykədiyi pəncərənin sərin şüşəsi az qala alovlanmaqda olan yanağına sərinlik gətirdi. Bu fiziki ağrıları ona unutduran və şüurunu əsir almış bir dilemma qarşısında idi; özünə haqq qazandırmaq üçün yüzlərlə səbəb uydursa da, peşmanlıq hissi üstünə domino daşı kimi yığılmış bütün bəhanələri yerlə bir edib "kaş ki"lərdən ibarət yenisini tikirdi. Balaca qardaşı ilə həyətdə top oynadığı qayğısız günlər. Lənətə gəlsin, top yenə qonşu həyətə düşdü. Onu götürməli, nəyin bahasına olursa-olsun bunu etməlidir. Bu düşüncə ilə irəli atılanda arxadan həyəcanla deyilmiş "qayıt!" əmrini eşitməzliyə vurdu. Artıq gecdir, həyətdə keşik çəkən əsgər duyuq düşüb. Gün batmaqdadır, göy qübbəsi isə tədricən tündləşən mavi-çəhrayı buludlarla çevrələnib. Az sonra arasında süzüb ənginliyə qovuşacağı buludlara, bəlkə də, son dəfə yerdən baxır. Budur, artıq onu incidən hər şey aşağıdadır. Bitdi: o xilas oldu…

***

- Beyin iflici keçirib. Böyük ehtimalla öncələr də onda şiddətli baş ağrıları müşahidə olunub. Yanında parasetamol tapdıq. Yenə gözləyək, görək ekspert rəyi nə deyir.. Bir də, bu vardı...

- Nədir elə? Baxa bilərəm?

Təhqiqatçı cibindəki zərfdən kağız çıxardı. Orada "Hörmətli Rəhim bəy, saat 00.00-da baş tutacaq tədbirimizə dəvətlisiniz!" cümləsindən başqa nəsə yox idi.

- Çox qəribədir, çox… Yollayın bunu da ekspertizaya, özü də dərhal.

Müstəntiq tələsirdi. Bu gün başını qaşımağa vaxtı olmayacaqdı. Gecəyarısı bir neçə dəqiqə fərqlə Zamiq Quliyevin saxlanıldığı kamerada ölü tapıldığı, Sabir Məmmədovun isə avtomobil qəzasında həyatını itirdiyi barədə məlumatlar almışdı, bu gün ərzində hər iki hadisə yerinə baş çəkməli idi…

***

"Sənə söylədiyim ən sadə gerçək,
Əgər insan,
Bu kiçik təlxək
Daşıyırsa özünü Tanrı saymaq xülyası,
Mən də başdan var olan,
Hər şey olan parçanın bir parçasıyam,
İşığı doğuran qaranlığın parçası!
Bir xilas işığı!"
*Höte, "Faust"*

Mart ayı boyunca bir-birinin ardınca baş verən qəribə hadisələr ölkəni bir-birinə vurmuşdu. Hüquq-mühafizə orqanlarının sözçüləri adətləri üzrə bir müddət səssiz qalıb yalnız bir neçə gün sonra şablon cümlələrlə jurnalistləri yola versələr də, dövlət qurumlarının da bir-birinə dəyməsi və çaşqınlığın miqyası ortada idi. Xəbər saytları və qəzetlər isə hər gün sorağı ölkənin müxtəlif şəhərlərindən gələn bir-birindən paranormal hadisələri manşetə çıxarırdı.

Zəncirin ilk həlqəsi 45 yaşlı müstəntiq Rəhim Rəhimovun müəmmalı ölümü idi. İlkin ekspertiza rəyində beyin iflicindən dünyasını dəyişdiyi göstərilsə də, cibindən tapılan zərf ayrı mətləblərə işıq salırdı. Həmin gecə avtomobil qəzasında dünyasını dəyişən nazir Sabir Məmmədovun və saxlanıldığı kamerada ölü tapılan sabiq mayor Zamiq Quliyevin də cibindən eyni məzmunda zərflər tapılmışdı. Baş verənlərin bir-biri ilə əlaqəsi olduğu ehtimalından çıxış edərək yaradılan istintaq qrupu kələfin ucunu itirmişdi. Nə bir barmaq izi, nə də kamera görüntüsü olduğuna görə iş əməllicə dolaşığa düşmüşdü. Lakin bu hələ başlanğıc idi və hətta ən sayıq müşahidəçi belə, bir neçə gün sonra baş verəcəkləri təxmin edə bilməzdi.

Özünü həmişə sayıq müşahidəçilərdən sayan Fazil işdə, dost-tanış arasında özünü məyus və çaşqın göstərsə də, əslində, qəlbən sevinirdi. Sevinci isə iki şeydən qaynaqlanırdı. Əvvəla, bütün bu olanlar onun təsisçisi və baş redaktoru olduğu “Bərabərlik” qəzetinin reytinqini qaldırmışdı. Son vaxtlar ictimaiyyəti elə də çox maraqlandırmayan mövzularla, ictimai-siyasi fiqurların vurulduğu tənqidi məqalələrlə, ölkə prezidentinə və onun uğurlu xarici siyasətinə həsr olunmuş mədhiyyələrlə baş qatan media orqanı bağlanmaq təhlükəsi ilə üz-üzə qalmışdı.

Tədricən daha dövlətə lazım olmadığını anlayan Fazil qəzetin daha bir müddət ömrünü uzatmaq üçün son aylarda yalanın dozasını bir az da artırmışdı: müxalif siyasətçilər, azad jurnalistlər və fəallar barədə sifarişli yazılarda təhqir, böhtan, ağır ittihamlarla yanaşı, fotomontajdan keçirilən kompramat xarakterli şəkil və sənədlər də yer alırdı. Bir neçə gün sonra həmin şəxslər həbs olunanda Fazil bunda öz "əməyi"nin də olduğunu düşünüb qürurlanırdı. Əslində, yazdığı uzun-uzadı məqalələrin həbslər dalğasına təsiri yox idi: onun qəzeti, sadəcə, həbs olunanların bir yığın oxucunun gözündən salınması işinə yarayırdı. Son vaxtlar isə məhz həmin oxucu dairəsinin daralması və kreslosunun laxlamasından bərk narahat idi. Son hadisələr bu mənada göydəndüşmə idi: uzun müddətdən sonra qəzetində diqqət çəkə biləcək maraqlı xəbərlər peyda olmuşdu.

Amma tək səbəb bu deyildi. Əsas olanı beyninin dərin qatlarında gizlənmişdi. Ağlından keçəndə diksinir, ixtiyarsız yan-yörəsinə baxır və tez də o fikri özündən uzaqlaşdırırdı. Özünü ikiyə bölünmüş kimi hiss edirdi. Tək qalanda o biri hissəsi üzərinə gəlirdi, hücumları güzəştsiz, amansız olurdu. Bu biri hissəsi özünə bəraət qazandırmaq üçün nə qədər arqumentlər gətirsə də, bu savaşda aşkar uduzurdu.

Bütün ölkəni silkələyən hadisələrin sorağı gəlməyə başladığı gündən tək qalmağa qorxurdu. Belə anlarda mübariz, dönməz Fazil pula satılmış Fazilin üzərinə hücuma keçir, uşaq kimi qabağına qoyub danlayırdı. Qüruru zədələnən Fazil boynunu büküb amansız hücum və ittihamların qarşısında susurdu. İşdə-gücdə, məclislərdə şən, fəal, ünsiyyətcil Fazil tək qalanda inqilabçı Fazildən yan qaçmağa çalışırdı. Amma indi durum bir qədər fərqli idi. Son hadisələr onda qəribə, sözlə izahı çətin olan bir ümid yaratmışdı. Ən radikal müxalif fəallar belə, çaşqınlıq içində idilər, "xəyanət", - özü də, deyildiyi kimi, hansı formada!, - baş verənlərə münasibətdə çoxunu ehtiyatlı davranmağa vadar edirdi.

Amma Fazil bu məsələ ilə bağlı hökmündə daha əmin idi: mistik bir qüvvə bu otuz ildə kimsənin bacarmadığını etməyə girişmişdi! Bunu düşünəndə üzünə xəfif bir təbəssüm qonur, amma kimsənin bunu görə biləcəyindən qorxurmuş kimi, tez də özünü yığışdırırdı. Onu sındıranlara qarşı kinli idi, amma bunu onların duya bilməsindən çox qorxurdu.

***

Mart axşamının soyuğu adamın iliyinə işləyirdi. Dünən gecə baş vermiş hadisələrin məhsuldar və yorucu etdiyi iş günü yekunlaşmışdı. Fazil ofisin qapısını bağlayıb Maybach-inə mindi və qolundakı saata ötəri nəzər yetirdi: doqquza on beş dəqiqə qalırdı. Düyməni basıb maşını işə saldı və evinə yola düşdü.

Mənzilə girəndə adəti üzrə ötəri nəzərlə divar saatına baxsa da, əqrəblərin geriyə doğru hərəkət etdiyinin fərqinə varmadı. Otağa girdiyi andan qolundakı saatın da əqrəbləri tərsinə hərəkət etməyə başlamışdı, amma çıxarıb stolun üstünə qoyanda ona da diqqət etmədi və özünü divana verib dərindən ah çəkdi. Yoldaşını iki gün əvvəl rayona, atasıgilə yola salmışdı, övladlarının da öz ailələri, ev-eşikləri vardı deyə, artıq ardıcıl üçüncü gecəni tək keçirəcəkdi.

Divana yayxanıb telefonunu çıxardı, amma açmadan divanın o başına fırladı. Gözləri divardakı rəsmdə idi – artıq neçənci dəfə idi ki, şəklə baxanda eyni hissləri keçirirdi. Həyat yoldaşı ilə çəkdirdiyi bu şəkildə otuz yaşı vardı və hələ boğazına "boyunduruq" keçirilməmişdi. Bütün bunlar məğrur baxışlarından da hiss olunurdu. Əvvəllər şəkildəki Fazilə hər baxanda daxili monoloqu başlayırdı. Bu dəfə nədənsə içi susdu. Həmin o bir neçə saniyəlik zaman dilimində yaxınlıqdakı masanın üzərində bir şey diqqətini çəkdi. Gözlərini qıyıb baxdı – düz masanın ortasında ikiyə qatlanmış qəzet vardı. Ona elə gəldi ki, bayaq qol saatını qoyanda stolun üstündə Hötenin "Faust" kitabından başqa heç nə yox idi. Əvvəl ayağa qalxmağa qalxmağa ərinsə də, maraq üstün gəldi. Qalxıb masaya yanaşdı. Qəzetin yuxarısında iri hərflərlə yazılmış başlığı oxumağı ilə dik atılıb qışqırmağı və geri çəkilməyi bir oldu: qəzet sahibi olduğu "Bərabərlik"dən bir buraxılış idi. Üzərində üç kəlmə söz yazılmışdı, yanında da yazı müəllifinin şəkli vardı: şəkildəki otuz yaşlı gənc özü idi, başlıq da ona məxsus idi: "*RƏDD OLSUN MONARXİYA!*"

Hiss etdi ki, dizləri əsir və otaq başına fırlanır, yenidən divana sərələnib gözünü tavana dikdi. Qəzetin bu buraxılışı düz iyirmi il əvvəl yayımlanmışdı. Həbsdən çıxandan sonra küncdə-bucaqda əlinə nə qədər nüsxə keçmişdisə, hamısını toplayıb yandırmışdı. Bu evə köçdüyü də heç beş il deyildi, köhnə nüsxənin masa üzərində olması sadəcə mümkünsüz idi. Bəlkə, gözünə görünüb? Ola bilər, niyə də olmasın? Bu gün çox gərgin keçmişdi, yorğunluqdan nə desən, olar. Bu düşüncə ilə güc tapıb masaya boylandı – qəzet yerində idi. Cəld özünü yığışdırıb ayağa qalxdı, masaya şığıyıb qəzeti qapdı və cırıb yumurladı. Bununla kifayətlənməyib mətbəxə keçdi, əlindəki kağız topasını isladıb zibilqabına atdı və zala qayıtdı. Yenidən divana əyləşib yerini rahatlamışdı ki, bu dəfə gördüyü şeydən vəhşətə gəldi, qışqırmaq istədi, səsi çıxmadı: divardakı rəsmdə həyat yoldaşı tək idi, otuz yaşlı bığıburma Fazil qeyb olmuşdu…

Gözünü açanda özünü divanda uzanmış halda gördü. Başı möhkəm ağrıyırdı, narahat uzandığı üçün boynu və beli də sızıldayırdı. Neçə saat yatdığını bilmək üçün instinktiv olaraq birinci pəncərəyə baxdı: hələ gecə idi. Divardakı saatın əqrəbləri isə 4.15-i göstərirdi; əqrəblərin tərsinə hərəkət etməsinin yenə fərqinə varmadı. Masanın üzərinə nəzər saldı: ora boş idi. Divardakı rəsmə baxmağı isə unutdu; baxsaydı, yəqin yenidən özündən gedəcəkdi - özünü elə bil kimsə şəkildən qazıyıb götürmüşdü. Yox, "qazıyıb götürmüşdü" o söz deyildi, sanki heç vaxt o şəkildə olmamışdı…

Gecələr tez-tez qarabasmaları olurdu. Bu da iyirmi il əvvəl gördüyü amansız işgəncələrin şüuraltında yaratdığı dərin izlərlə bağlı idi. Bayaq gördüklərini də qarabasma hesab edib güc-bəla ilə ayağa qalxdı, hamama gedib əl-üzünü yaxşıca yudu. Yataq otağına keçib soyunurdu ki, zaldan gələn televizor səsinə dik atıldı. Heç nə düşünmədən, elə tuman-köynəklə zala tərəf götürüldü.

Bayaq uzandığı divanda keçisaqqal, başında qəribə papaq, baş-dan-ayağa qırmızı geyinmiş ortayaşlı birisi oturmuşdu, sırtıq təbəssümlə düz onun üzünə baxırdı. Televizorda isə gənc Fazil yumruğunu düyünləyib aqressiv tonda hakimiyyətə meydan oxuyurdu.

Fazil ayaq üstündə quruyub taxtaya döndü. Güclə eşidiləcək qədər zəif səslə verdiyi "sən kimsən?" sualının cavabı özünü çox gözlətmədi: keçisaqqal cəld ayağa qalxıb yaltaqcasına baş əydi:

- Çox üzr istəyirəm, gecənin bu vaxtı sizi də yuxunuzdan etdim. Nə qədər çalışsam da, televizorun səsini ala bilmədim. Kömək edin mənə, xahiş edirəm, – əlini cütləşdirib yalvarış görkəmi aldı və pultu ona uzadıb geri çəkildi.

Fazil sanki bütün bunlar normalmış kimi sakitcə pultu götürdü və səsi aldı.

- Nə qəşəng danışırsınız, bəy! Adam lap cuşa gəlir!

Fazil cavab vermədi. Dili qurumuş, şüuru keyimişdi; gecənin bu saatında bu axmaq görkəmli yad adamın evində peyda olması, zaldakı televizorda onun 2005-ci ildəki çıxışını izləməsi… - baş verənləri dərk etməkdə çətinlik çəkirdi. Gördüyü anormallıqlar onu sarsıtmış, müqavimətini qırmışdı; yoxsa normal halında, evinə icazəsiz daxil olmuş bu yaramazı döyə-döyə evdən qovar, ya da polisə şikayət edərdi. İndi isə sönük gözləri ilə bu yad adamı süzməkdə idi. Beyni o qədər keyləşmişdi ki, içəridən kilidlədiyi qapını necə açıb otağa daxil olduğunu sorğulamadı da.

- Nə lazımdır sənə?

- Hmm, açığı heç nə. Sağ olsun Fazil bəy, istədiklərimi verib. Bu arada, çox baməzə adamdır! – Keçisaqqal göz vurub qəhqəhə çəkdi.

- Nə danışırsan sən?! Kimsən, nə istəyirsən məndən?!

Yad nəsə xatırlamış adamlar kimi özünü yığışdırıb qaşlarını düyünlədi:

- Bura bax, götür bunları imzala, qəbzi yaz, mən gedim, işim onsuz da başımdan aşır, – cibindən bir-iki sənəd və qələm çıxarıb stolun üstünə qoydu.

Fazil ixtiyarsız qələmi götürdü və sənədləri gözdən keçirdi.

- Bax, ora qol çək. Altına da yaz ki, "Mən, Fazil Arif oğlu Məmmədov tapşırığı uğurla icra etdiyim üçün dövlətimin mənə ayırdığı 1000 manat mükafatı aldım".

Fazil bir anlığa duruxdu. Bir, əlində tutduğu sənədə, bir də, sırtıqcasına gülümsəyən keçisaqqala baxdı və qəfil onun üstünə atılıb boğazından yapışdı:

- Ə, qəhbə balası qəhbə, sarımısan məni?! Sən öləsən, boğaram səni, tez ol, de görüm kim yollayıb səni!

- Qəhbə sənsən, mənliyini satmış şərəfsiz! Burax məni! – Keçisaqqal onun öz səsi ilə cavabını qaytardı.

Öz səsini tanıyan kimi, Fazilin qolu boşaldı, yerə çöküb süst qaldı və yazıq-yazıq altdan-yuxarı keçisaqqala baxdı.

- Bax belə. Ağıllı ol və deyilənləri et. Sən heç kimə lazım deyilsən daha. Heç onlara da, – saqqalını tumarlaya-tumarlaya yerə çökmüş şəxsi, iyrənc bir məxluqa baxırmış kimi süzüb davam etdi: – Belə baxanda mənim özümə də, – masada yenicə peyda olan şampan şüşəsini başına çəkib əlini cibinə atdı, oradan qəzet bükülüsünü çıxarıb döşəmədə uzanılı halda qalan Fazilin üstünə tolazladı.

Fazil keyimiş barmaqları ilə bükülünü açıb başlığı oxudu:

"Qərb agenturasının marioneti Həsən Əliyev – Maska cırıldı!"

- Günah səndə deyil e, sənin yiyələrindədir, – keçisaqqal kinayə ilə gülüb başqa qəzet çıxardı, eyni kinayə ilə üstünə atdı.

Bir neçə il əvvəl çıxmış buraxılış idi. Manşetə iri hərflərlə "Əxlaqsızlıq sərhəd tanımır! Rüstəm Kərimlinin qızının yeni intim şəkilləri!"

- Hə, bu arada, qız bu ləkəyə dözməyib intihar etmişdi, "peredoz"dan ölməmişdi, – cibindən alma çıxarıb yeyə-yeyə davam etdi, – yazıq qız heç siqaret də çəkmirdi… Təsəvvür elə, ağlın başındadır, haqq tərəfindəsən, amma adını dəli qoyurlar və səni dinləmək istəmirlər, hər fürsətdə ağzının üstündən şillə ilə vurub susdururlar, – almanı iki-üç dişləmə yeyib qurtardı və düz Fazilin gözlərinin içinə baxıb davam etdi, – bax, ondan sonra adam heç nədə məna görmür, hətta yaşamaqda da. Əlbəttə, qəfil haradansa peyda olan xəstəlik bu istəyi qabaqlamasa, – göz vurub qımışdı.

Fazil nəsə demək istəsə də, bacarmadı. Elə bil dili tutulmuşdu.

- Belə-belə işlər! Onsuz da öz poxlarını məndən gözəl bilirsən, ona görə çox sıxmayacağam, – keçisaqqal divana yayxandı, pultu götürüb televizora tutdu və kanalı çevirdi. Ekranda düzənlikdə mahnı oxuya-oxuya qəribə şəkildə rəqs edən (bu rəqsdən daha çox hansısa dini ritualın icrasına bənzəyirdi) tuman-köynəkli kişi peyda oldu. Keçisaqqal televizora yox, boşluğa baxan Fazilə sarı çönüb gülümsədi. Fazil nəinki baxmırdı, həm də, deyəsən, eşitmirdi, ya da eşitdiklərinə reaksiya verəcək gücdə deyildi. İstənilən halda o, televizorda gedən kadrlardakı kişinin özü olduğunu görmədi, öz səsi ilə oxunan narahatedici mahnıya da reaksiya vermədi.

- Çöldə hava soyuqdur, gərək yaxşı geyinəsən. Bizim kimsəsiz palatada qarın yatalağından ölən yaşımız deyil. Düz demirəm?

Fazildən cavab gəlmədi. Keçisaqqal buna məhəl qoymayıb əlini ölçə-ölçə davam etdi:

- O "Qərb marioneti"nin də anası gethagetdədir. Yiyələrin arvadı çərlədib öldürəcəklər. Bir tərəfdən oğlunun dərdi, digər tərəfdən maddi sıxıntılar. Çətindir, çox çətin…, – başını bulayıb dərindən ah çəkdi.

- Sənin anana da Allah rəhmət eləsin, bilirsən də niyə ölmüşdü? Yoxsa bunu da unutmusan? – Sınayıcı nəzərlərini həmsöhbətinə dikib cavab gözlədi.

Fazilin boşluğa dikilmiş donuq gözlərindən yaş süzüldü.

- Unutmamağın yaxşıdır. Mən amma daha gözəl xatırlayıram. Elə bil dünən olub… Üstündən nə qədər keçib?

Fazil susdu. Yerə dizini atmış şəkildə donub qalmışdı. Keçisaqqal özünü o yerə qoymayıb öz sualına özü cavab verdi:

- On beş il keçib… Onu sənin dərdin öldürdü. Hələ də gözümün qabağından getmir. Son nəfəsində də adın dilində idi. Neyləməli, ay Fazil, neyləməli?! İndi də eyni aqibəti yazıq Həsənin anasının başına gətirirlər.

Keçisaqqalın sifəti dəyişməyə başlamışdı. Gözlərini qıyıb masadakı kitabı vərəqlədi.

- Mütaliən yaxşıdır ha bu arada. "Faust" da yaxşı kitabdır. Höte boyundan yuxarı tullanmışdı. Amma olsun, yaxşı işlər cəsarət tələb edir, – kitabı stolun üstünə qoyması ilə otağa yayılan kəsif qoxu bir neçə saniyəyə qəfil kəsildi.

- Həə, o qədər şey dəyişib bu on beş ildə, ay Fazil… Bundan sonra da dəyişməyə davam edəcək, deyim biləsən…, – əlini saxlayıb üzünü ona çevirdi, – Hə, unutmuşdum axı, onsuz da bilirsən və düz bilirsən. Amma onu görəcəksənmi, ya yox, bilmirəm, – xırda gözləri ilə Fazili hiyləgərcəsinə süzən keçisaqqal elə bil bayaqkı adam deyildi. Başdan-ayağa qırmızı paltarı kostyum-şalvarla əvəz olunmuşdu, papağı da yoxa çıxmışdı. Onda çox sürətlə gedən metamorfozanı Fazil görmədi, amma çox güman ki, görsəydi də, reaksiya verməzdi.

- Bu on beş ildə çox şey dəyişib… Dəyişməyən bilirsən nədir?

Fazildən səs çıxmadı. Bir neçə dəqiqə çəkən sükutu artıq geriyə yox, irəli hərəkət edən saat əqrəblərinin çıqqıltısı və televizorda rəqs edən qəribə adamın zarıya-zarıya oxuduğu mahnının bir-biri arasında rabitə olmayan sözləri pozurdu. Ruhi xəstəyə bənzəyən tuman-köynəkli adam oxuya-oxuya dövrə vururdu, özü də ondan təxminən yüz metr məsafədə ehtiyatlı addımlarla ona yaxınlaşan başqa birini görmədən:

*Piyadalar şahlarına,*

*Tabe olaraq*
*Onunla birləşərək*
*Boğdular aydınlığın,*
*Gözqamaşdıran şüalarını!*

- Qəribə adamsan e deyirəm. Məhkəmələrdə səsini başına atıb üzə duran Fazil hanı? Göstəriş gəlməlidir gərək? Üzə durmaq demiş, o sonuncu məhkəmədə mən də zalda idim. İt kimi idin! Mən şəxsən çox bəyəndim. Sənin məhkəməndə də mən üzünə duracam, çıxışımı qiymətləndirərsən, – əlini əlinə vurub qəhqəhə çəkdi və tez də ciddiləşib davam etdi, – sual verdim e bayaq. Bu illər ərzində dəyişməyən nədir, bilirsən?

Fazil elə bil lom udmuşdu. Hərəkətsiz gözlərindən axan yaş da dayanmışdı və bayaqkı dəhşətdən əyilmiş sifət bir az da əyilib təmiz eybəcər hala düşmüşdü. Kənardan onu tanıyan kimsə baxsaydı, saçları ağarmış və sifəti bir xeyli qırışmış Fazili, çox güman, tanımaqda çətinlik çəkərdi. Televizordakı narahatedici səs isə fəryada çevrilmişdi:

*Onlar bilmirdilər,*
*Onlar bilmirdilər ki,*
*Axırları çatacaq,*
*Bütün yaşatdıqlarını*
*Özləri yaşayacaqlar!*

- Gəl mən deyim, – Fazilin ciddi və gur, xırıltısız səsi sükutu pozdu. Keçisaqqal əriyib yoxa çıxmışdı, onun yerində isə otuz yaşlı gənc, saç-saqqalı şəvə kimi qara Fazil oturmuşdu. Amma yerə diz çöküb gözünü boşluğa dikmiş Fazil buna da heç bir reaksiya vermədi.

- Dəyişməyən mənəm. Bu illər tək məni dəyişmədi! Hər şey dəyişəcək, hamı gedəcək, kölgəsinə sığındığın heç nə qalmayacaq, amma mən dəyişməyəcəm! Sən ləyaqətsiz, qorxaq həşərat isə məhv olub gedəcəksən! Hamınız məhv olacaqsınız, hamınız!

Gözləri alovlanan cavan Fazil ayağa qalxıb o birinin qarşısında durdu, yaxasından tutub silkələdi:

- Gözlərimin içinə bax! Gör dəyişmişəm? Cavab ver, şərəfsiz məxluq!

Fazil onu eşitmirdi, ifadəsiz, donuq baxışları bayaqkı kimi boşluğa dikilmişdi. O,

*Sayrışan ulduzların,*
*Bədirlənmiş ayın şəfəqində göyə yüksəlir,*
*Yüksəldikcə yüksəlirdi.*
*Aşağıdakı çirkaba son dəfə*
*Qalxdığı ənginlikdən tüpürərək,*
*Azad olmaqda idi…*

***

Fazildən üç gün xəbər çıxmadı. İnformasiya kanalları həmin aralıqda məşhur media patronunun qəfildən yoxa çıxması xəbərini və DİN-in verdiyi yolaverdi açıqlamaları tirajlayırdı. Onu son dəfə evinə gedəndə görmüşdülər və ondan sonra gördüm deyən olmamışdı. Evində axtarış aparılsa da, cildi qarsımış kitabdan başqa şübhə çəkəcək nəyinsə ələ keçməməsi, içəridən bağlanmış qapı, ümumiyyətlə açılmamış pəncərələr, telefonunun evdə, divanın üstündə qalması, yataq otağındakı çarpayıya səliqəsiz sərilmiş paltarlar şübhələri və cavabsız sualların sayını artırırdı. Fazil elə bil bir gecənin içində buxarlanmışdı.

Lakin bu qeyri-müəyyənlik çox sürmədi. Axtarışların dördüncü günü Qobustan rayon polis şöbəsi mərkəzə əməkdaşlarının Fazili tapmasını məruzə etdi. Kəndlilərdən biri çöllükdə tuman-köynəkdə qışqıra-qışqıra rəqs edən birisini görüb yaxınlaşanda həmin adam "ritual"ı dayandırıb ona tərəf cummuşdu. Kəndli zirək tərpənib onu zərərsizləşdirmiş və polisə məlumat vermişdi…

Bir həftə sonra, səhər saat 10-da Klinik Psixiatriya Xəstəxanasının iki nəfər əməkdaşı özündən çıxmış Fazilin qoluna girib baş həkimin otağından apardı və aldığı təlimat əsasında sakitləşdirici vurub 7-ci palataya yerləşdirdi. Baş həkimin qəbulunda və dəhliz boyunca Fazilin "Mən dəyişməyəcəm! Dəyişməyəcəm mən! Rədd olsun monarxiya! Məhv olacaqsınız hamınız! Sonu çatacaq hamınızın! Sıra çatacaq hamınıza!" qışqırıqlarına kimsə önəm vermədi; burada belə şeylər tez-tez olurdu. Sonralar nəzarətçi tibb bacısının dediyinə görə, o, gecələr qışqıra-qışqıra boşluğa təhdidlər yağdırır, tez-tez gah hansısa xilaskardan bəhs edir, gah hönkürüb üzr istəyir, gah da yatağında oturub uzun-uzadı anlaşılmaz izahlar verirdi. Bir neçə gün sonra bütün xəbər saytlarının manşetində məşhur jurnalistin müalicə aldığı Psixiatriya Xəstəxanasında dünyasını dəyişdiyi xəbəri yer aldı. Tibbi ekspertiza öz rəyində onun qarın yatalağından keçindiyini bildirdi. Amma eşitdikləri ilə kifayətlənməyən müstəntiq onun yatdığı palataya baş çəkmiş, çarpayısının başında, divarda çətinliklə oxunan xətlə cızılmış cümlələr aşkarlamış, fotoşəkillərini çəkmişdi. Daha sonra palatadakı kameranın, Fazil bura yerləşdirildiyi gündən lentə aldığı hissəni diqqətlə nəzərdən keçirsə də, xəstənin divara nəsə yazdığı görüntüləri ilə rastlaşmadı. Amma istənilən halda əlində ciddi sübut vardı ki, çox güman, iş üçün mühüm önəmi olan bir faktın mövcudluğuna işarə idi…

*O kəslər*
*Aydınlığı qaranlıqda boğarkən,*
*Bilmirdilər bir gün bu böyük oyunda,*
*Əl dəyişəcək,*
*Taxtadakı fiqurların hamısı,*
*Piyadadan şaha kimi,*
*Hamısı devriləcək!*

***

Tavanın düz altındakı balaca nəfəslikdən süzülən bozumtul şüaların işıqlandırdığı yarıqaranlıq və rütubətli otaqda heç nə gözə dəymir. Qışqırmaqdan boğazımın ağrımağa başladığını hiss edirəm. Yavaş-yavaş nəfəsim də daralır. Bura haradır? Niyə qapı yoxdur? Necə düşmüşəm buraya? Necə çıxa bilərəm? Suallar bir-birinə qarışsa da, düşünmək hayında deyiləm. Döyükmüş dana kimi özümü divarlara vurub qışqırmağa davam edirəm.

Özümlə saatlarla davam edən mənasız savaşdan tamam heydən düşüb yerə çökürəm. Saatın neçə olduğunu bilmirəm. Divara yansıyan boz işıqdan da günün hansı hissəsi olduğunu təxmin etmək çətindir. Artıq böyrəklərimə sancı girdiyini hiss edəndə vur-tut iyirmi beş kvadratmetrlik bu dar qutuda (qapı və pəncərəsiz məkanı otaq adlandırmaq çətindir) dəlmə-deşik olmadığı üçün şalvarımı çəkib çöməlirəm və daş döşəməyə işəyirəm. İçərini tər və sidik iyinin qarışdığı tünd qoxu bürüsə də, buna önəm vermirəm və süst qalıb gözləməyə başlayıram. Nəyi gözlədiyimi heç özüm də bilmirəm. Amma başqa yolum yoxdur. O qədər qışqırmışam ki, artıq səsim də çıxmır. Bir az əvvəl döşəməyə buraxdığım mayeyə yapışıb qalmışam. Ürəyim sıxılır. İlahi, bu nə oyundur düşmüşəm?!

Bəlkə, ölmüşəm? Əlimi döşəməyə yapışdıran qatı sidiyin iyi burnuma vurmasaydı, buna inanardım. Ölülər işəmirlər. İşəsələr də, xaric etdikləri mayenin içində oturub deyinmirlər.

Başımı az qala dağıdan ağrı neçə saatdır ki, kəsmir. Adi başağrısı deyil yəqin. Əlimi bir neçə dəfə ağrıyan yerə aparıb burnuma yaxınlaşdırsam da, qan iyi hiss etmirəm. Az qala bütün bədənim ağrıyır, amma daha ciddi problemlərin fonunda bu ağrılar elə də çox əzab vermir. Həqiqətən də, dünyada qeyri-müəyyənlik qədər dəhşətli şey azdır. Bu, mənbəyi bizə məlum olan əzablardan daha çox əziyyət verirmiş.

Zaman anlayışım itsə də, mənə elə gəlir, təxminən səkkiz saatdır ki, buradayam. Buraya necə gəldiyimi isə heç cür xatırlaya bilmirəm. Axırıncı dəfə uşaqlarla Fəvvarələr Meydanında idik. Görəsən, onlar haradadırlar? Başlarına nəsə gəlməyib? Sağdırlar, yoxsa ölüblər? Bilmirəm. Ağrılar şiddətlənir. İşıq isə zəifləməkdədir. Yəqin ki, axşam düşür.

Durduğum yerdə yenicə mürgüləməyə başlamışdım ki, qəfil qopan şaqqıltı səsindən diksinib ayağa qalxıram. Səsin hansı yandan gəldiyini kəsdirə bilmədiyim üçün hara söykənəcəyimi də bilmirəm. Elə bil, beş-altı metrlik balaca divar yarılır və gözqamaşdırıcı işıq təhkim olunduğum balaca qutuya hücum çəkir. İki nəfər enlikürək polis içəri girir və divardakı yarığın bağlanması ilə qutunun tavanındakı balaca lampanın yanması bir olur. Əgər ağrıların yaratdığı hallüsinasiya deyilsə, mənə elə gəlir ki, bu polislər əkizdirlər. Necə də bir-birilərinə bənzəyirlər! Elə bil bir almanı iki yerə bölüblər.

Polislərin biri qapının ağzında durub, o biri isə yaxamdan tutub düz çənəmin altından yumruq ilişdirir. Səndələyib o biri polisin ayağının altına sərilirəm. Məni vuran isə cibindən smartfon çıxarıb üstümə tullayır:

- Aç bunu, özü də cəld ol! Yoxsa ananı gətizdirəcəm bura! Eşidirsən məni?!

Təşviş içində üstümə atılmış smartfona, məni vuran qəzəbli polisə və onun kənarda səssiz durub gözünü döyən əkizinə baxıram. Sarsıldığım üçün dilim söz tutmur, ya çox qorxduğumdan, ya da şoka düşdüyümdən ağlamağa başlayıram.

Elə həmin an gözümün altına ilişdirilən ikinci yumruq zərbəsindən başım divara dəyir.

Gözümdən çıxan ulduzabənzər qığılcımlar qutunu və polisləri görünməz etsə də, inildəyə-inildəyə ayağa qalxmağa çalışıram, amma gücüm yetmədiyi üçün üzü üstə yerə sərilirəm.

- Kodu nədir? – Polis üstümə əyilib saçımdan tutur: - Səninləyəm e, küçük! Kodu de!

Özümdə güc toplayıb az qala zarıldayıram:

- Bilmirəm, vallah bilmirəm… Haradayam mən? Nə olub? Xahiş edirəm, döyməyin məni, qurban olum, döyməyin…

Saçımdan tutmuş əl başımı divara çırpanda az qaldı ki, başım yerindən qopsun.

- Öz xoşunla demirsən ki?! – Polisin qəzəbli səsinə kinayə tonu qarışır: – Sən pidaraz, adam dilində başa düşmədin. Demək ki, neynirik?

Verdiyi sual havadan asılı qalır. Gözümü kor edəndən sonra ancaq qəzəbli polisin səsini eşitdiyim üçün mənə elə gəlir, o birisi artıq aradan çıxıb.

- Demək, dalını dağıdırıq! – Sualına özü də cavab verir.

Şüurum keyidiyi üçün indicə eşitdiyim sözü dərk etməkdə çətinlik çəkirəm. Başımın ağrısı elə həddə çatıb ki, gücüm yetsəydi, polisin əlindən qurtulub divara doğru sürünər və başımı partlayana qədər daşa çırpardım.

Zəncirbənd səsini eşidəndə dik atılıram və ixtiyarsız geri çevrilirəm. Arxamdakı polis isə iri əlləri ilə çiynimdən tutub yerə yıxır və üstümə çıxır.

- Kod nədir? Axırıncı dəfə soruşuram! Onsuz vurmağa adam axtarırdım, yaxşı düşmüsən əlimə!

Şalvarımı çəkir və yerində silkələnməyə başlayır. Onun nəyə hazırlaşdığını başa düşdüyüm üçün dəhşət içində çığırıram:

- Bilmirəm, atamın canı bilmirəm! Eləmə, yalvarıram, eləmə!

O anda üstümə çökən ağırlıqdan az qalır ki, belim qırılsın. Üstümdəki yük fırtınaya çevrilir, az sonra yavaşca sürüşüb böyrümə düşür. Havada uçuşan söyüşlərdən, tappıltı səslərindən və asta-asta qalxan toz iyindən hiss edirəm ki, iki nəfər boğuşur. Gözüm hələ də görmədiyi üçün yerimdə qalıb qulaq kəsilirəm. Az qala qulaq pərdəmi yaran güllə səsi ilə qəzəbli polisin söyüşləri qəfil kəsilir və boğuq xırıltı ilə əvəzlənir. Xırıltı təxminən bir dəqiqə sürür və qutuya sükut çökür. Hadisələr sürətlə cərəyan etdiyinə, üstəlik, gücüm tükənməkdə olduğuna görə nə baş verdiyini anlaya bilmirəm. Amma uzandığım yerin yavaş-yavaş qızdığını hiss edirəm. Əlimi başımın altına aparanda isti mayeyə batır. Həmin anda bayaqkı ulduzlar yenidən peyda olur, qulağımdakı cingilti ilə hər şey sona yetir...

***

(36 saat əvvəl)

Yuxudan qan-tər içində oyandı. Ayılan kimi dərhal divardakı saata baxmaq adəti vardı. Amma bu səhər əvvəlkilərə bənzəmirdi, adətinə xilaf çıxdı: yerinin içində əynindəki formanı əlləşdirməyə başladı. Bədənindən axan tər-sudan islanan forma əyninə yapışmışdı. Başındakı kepkanı çıxarmaq cəhdi də uğursuz oldu: onu sanki başına kleyləmişdilər.

Yuxudan kal oyandığı üçün key kimi idi, gördükləri ona çatmırdı: Bu forma kimindir? Bunu ona kim geyindirib? Niyə forma ilə yatıb?

Dünən axşam pabda uşaqlarla əməllicə içsə də, evə necə gəldiyi yadında idi. Amma indi gördüyü bu anormallığa ad tapa bilmirdi.

Yerindən çətinliklə qalxa bildi. Kəmərindən sallanan silah və dubinka əynindəki formanı xeyli ağırlaşdırırdı. Belə də zarafatmı olar? – deyə düşündü. Amma çevrəsində onunla bu cür rəftara kimsə cürət etməzdi.

Əlini silaha atdı, onun oyuncaq olmadığını anlayanda bədənindən gizilti keçdi. Gözləri çiynindəki paqonlara sataşanda əndişəsi daha da artdı. Cibindən çıxan vəsiqə isə onu çarpayıya çökdürdü. Yox, bu, zarafat deyildi!

Bir xeyli çarpayıda hərəkətsiz qaldı. Nə edəcəyini bilmirdi. Aradan keçən yarımsaatlıq müddətdə balaca bacısı, ata və anasının olduğu evdən hənirti belə gəlməməsi onu təəccübləndirdi. Baş verənləri dərk etməyə çalışırdı ki, telefonuna gələn səsli bildirişə diksindi. Gələn mesaj "Elmir rəis" kimi qeyd olunan nömrədən idi. Votsapa girməyə macal tapmamış həmin nömrədən zəng gəldi. Əynindəki formaya uyğun olmayan pişik cəldliyi ilə qalxıb zəngi açdı.

- Alo, Nağıyev, eşidirsən məni? Sabahın xeyir.

- Sabahınız xeyir, rəis. Bəli, eşidirəm.

- Sabahdan yazıram, iki xətt düşür, amma oxumursan. Demişdik axı, saat səkkizdə şöbədə olsun hamı.

- Üzr istəyirəm, rəis, görməmişəm. İndi çıxıram.

- Görməmişəm nədir?! Cəld ol. Gecikmə ha!

- Oldu, rəis.

Telefonu söndürüb çarpayının üstünə tullamağı ilə özü də çarpayıya çökdü. Elə bil bir neçə saniyə əvvəl telefonu onun yerinə başqası götürmüşdü: Elmir kimdir, nə şöbəsi, söhbət nədən gedir? Bu nə oyundur düşüb?

Zəngə cavab verməsi məntiqli görünmədi ona. Anidən Elmiri yığıb hər şeyi olduğu kimi ona danışmaq, əynindəki formanı da soyunub təhvil vermək keçdi ağlından. Bu fikrin təsiri altında əlini formaya atıb dartışdırmağa başladı. Amma düymələr açılmaq bilmirdi. Onları qırıb atmağa çalışdı. Yenə də alınmadı. Bu qəribəlikdən hövllənib özündən çıxdı, əynindəki forma ilə boğuşmağa başladı. Döşəməyə sərilib dəli kimi ora-bura çevrilsə də, forma əynindən çıxmırdı ki, çıxmırdı: paltar sanki dəriyə dönərək ətinə pərçimlənmişdi. Dırnaqları ilə formanı bədəni göynəyənə kimi didişdirməyə başladı. Amma dırnaqlar da tab gətirməyib qanrılanda, dişlərini işə saldı. Həmin vaxt orada kimsə olsaydı, on dəqiqəyə yaxın döşəmədə qışqıra-qışqıra əynindəki formanı didişdirən bu adamın halına xeyli gülərdi.

Nəhayət, yorulub heydən düşəndə divardakı saat yeddini göstərirdi. Döşəmədə hərəkətsiz halda gözlərini tavana dikmişdi. Qəfil ağlına gələn fikirdən cəld ayağa qalxdı, mətbəxə yüyürüb bir qrafin su və kibrit gətirdi. Kibriti yandırıb mundirin qoluna yaxınlaşdırdı. Parçanın səthinə yaxınlaşmağı ilə odun sönməyi bir oldu. Tələsik birini də yandırıb eyni qaydada parçaya yaxınlaşdıranda, o da söndü. Qutuda iki kibrit qalanda dayandı, qutunu cibinə qoydu. Bir qədər fikrə gedib ayağa qalxdı və rəfdən spirt götürüb kibrit qabını qoyduğu cibinə yerləşdirdi. Məlum məsələdir, mübarizə indilik mənasızdır, əbəs yerə vaxt itirir. Saat səkkizin yarısını vurdu və bayaq çarpayısının üstünə fırlatdığı telefonunu götürüb evdən çıxdı.

***

Şöbənin həyəti dolu polis idi. Bununla belə çox qəribə sükut hökm sürürdü. Nağıyev özünü içəri salanda artıq sıra düzülmüşdü. Hələ də heç nəyi anlamasa da, özünü cərgəyə vurdu. Onu görmürmüş kimi, kimsə yerindən dəbərmədi. On-on beş dəqiqə davam edən cansıxıcı səssizliyi haradansa peyda olub ötəri nəzərlə sıranı süzən hündür, yaşı əllini haqlamış zabitin bağırtısı pozdu:

- Mərdanovun taboru Fəvvarələr meydanını! Cəlilovun taboru Səməd Vurğun parkını! Zərbalıyevin taboru Əziz Əliyev küçəsini! Əsas şöbə ilə əlaqəni kəsməyin!

Qabaq sıralardan üç nəfər ağız-ağıza verib qalın səslə "Oldu!" deyə qışqırdı.

- Hər kəs öz taboruna təlimatlarını versin!

Zabitin son əmrindən dərhal sonra ümumi sıra dağıldı və üç hissəyə parçalandı. Nağıyevin olduğu hissə şöbənin arxa həyətinə keçdi. Tabor təbaşirlə xətlənmiş balaca həyətdə düzlənib qurtaran kimi saçları ağarmış cüssəli zabit irəli çıxdı, boğazını arıtlayıb nitqinə başladı:

- Uşaqlar, biz çox çətin işin öhdəsindən gəlməliyik. Bilirsiniz, sabah günorta üçün qanunsuz aksiyalar planlaşdırılıb. Məqsəd həmişəki kimi, daxildə çaxnaşma yaratmaq və sabitliyi pozmaqdır. Ona görə, sayıqlığı bir an belə olsun, itirməməliyik. – Bir neçə saniyəlik fasilə verib, nəyisə yadına salmağa çalışırmış kimi, taboru süzdü. – İlk etməli olduğumuz şey, bu gün günortadan etibarən təxribatçıların yerləşdikləri mənzillərin girişində növbə qurmaq, evindən çıxanları bir-bir maşına salıb şöbəyə gətirməkdir. Ünvanları bir azdan göndərəcəm. Burası aydındır?

Tabor bir ağızdan "Bəli!" qışqırdı.

- Çox pakizə! Əlavə premiya nəzərdə tutulub bununçün, deyim, biləsiniz. Rəhbərlik bu məsələdə aktivliyi lazımınca qiymətləndirəcək. İkinci və ən əsas məsələ isə sabah səhər saat onda Fəvvarələr Meydanında olmaqdır. Qalan şeyləri bilirsiniz onsuz. Nə yenilik olsa, mənə məruzə edin.

Tabor yenidən bir ağızdan "Oldu!" qışqırdı.

- Əla. Bir azdan göndərəcəyim ünvanlarda yavaş-yavaş yerləşməyə başlayın. Azad!

Təxminən iyirmi nəfərdən ibarət tabor dağılışdı. Gün yavaş-yavaş günortaya qalxmaqda idi. Nağıyev yenicə şöbənin həyətini tərk edib parka sarı istiqamət götürmüşdü ki, telefonuna bildiriş gəldi. Səhər zəng edən Elmir adları və ünvanları göndərmişdi. Niyəsə mesajı görən kimi Nağıyevi soyuq tər basdı. Alnını sildi və dərindən ah çəkib votsapa girdi.

Siyahıda cəmi iki ad və ünvan olsa da, Nağıyevin dizləri boşaldı, dünya başına fırlandı və yerə necə çöməldiyinin fərqinə də varmadı. Gözlərini boşluğa dikib bir dəqiqəyə yaxın beləcə dayandı. Yüngül başağrısı hiss etməyə başlamışdı, ayağa qalxsa, səndələyib yıxılacağını düşünüb bir xeyli əlini yerə dayayaraq qaldı. Bir neçə dəqiqə sonra özündə güc tapıb yenidən mesaja baxanda isə gördüyünün onu aldatmadığına əmin oldu. Bu gecə "zərərsizləşdirib" şöbəyə gətirəcəyi iki "təxribatçı"dan biri onun uşaqlıq dostu Fərid idi.

Mundir daş olub əynindən sallansa da, tez özünü ələ alıb dikəldi və Fəridin əzbər bildiyi nömrəsini yığdı. Fərid telefonu açan kimi heç salamlaşmadan az qala pıçıldadı:

- Fərid, axşam evə getmə. Polislər səni axtarır. Sonra danışarıq. Sadəcə mən dediyimi et və evə getmə.

- Ala, onsuz evə getməyəcəkdim. Axşam Ağagildəyəm. Gəl də sən də.

Qəfil gələn çox güclü başağrısı Nağıyevin vücudunu keyitdi. Elə bil başının düz ortasına xəncər sancdılar. Əvvəl dili söz tutmadı. Canı möhkəm ağrıdığı üçün, az qala, telefonu əlindən yerə salacaqdı. Amma özünü o yerə qoymadı, güc toplayıb dedi:

- Gələrəm. İndi əlimdə başqa işim var… Nəysə, danışarıq. Özünə yaxşı bax.

Zəng bitən kimi sağ əlini cibindəki kibrit və spirtə atdı, sol əli isə dərhal bu birinin üstündən vurub mane oldu. Başağrısı dayanmadan şiddətlənirdi. Güc-bəla ilə ratsiyanı ağzına yaxınlaşdırdı:

- Fərid Qayıbov bu gecə yaşadığı ünvanda olmayacaq. Naxçıvanski küçəsi ev üç. Buraya göndərin əməkdaşı…

***

Şər qarışmaqda idi. İki saata yaxın idi ki, binanın həndəvərində dolaşırdı. Amma bu müddət ərzində göstərilmiş əlamətlərdə olan heç kim gözünə dəyməmişdi. Əyninə kip yapışmış mundir gün ərzində onu bir xeyli taqətdən salsa da, çoxdan taleyinə boyun əymişdi. Əvvəl binanın qabağında var-gəl edə-edə dərin düşüncələrə dalırdı. Amma tezliklə heç bir nəticəyə vara bilməyəcəyini anlayıb düşünməyi də buraxdı və heç nə düşünmədən gözləməyə davam etdi.

Darıxdığını hiss edəndə siqaret almaq üçün yaxınlıqdakı köşkə tərəf istiqamət aldı. Siqareti təzəlikcə tərgitsə də, bunsuz heç cür alınmayacağını düşündü. Elə köşkə yaxınlaşmaqda idi ki, bir neçə metr aralıda nəsə diqqətini çəkdi. Gənc oğlan və qız skamyada qol-boyun olub sakitcə öpüşürdülər. Əvvəl duruxdu və buna əhəmiyyət verməyib köşkə doğru addımlamağa davam etdi. Amma niyəsə səhərki başağrısı yenidən peyda oldu və tədricən güclənməyə başladı. Hər iki əli ilə başını möhkəm tutdu. Ağrı yavaş-yavaş möhkəmlənməkdə, qulağı da batmaqda idi. Çətinliklə bir neçə addım da atdıqdan sonra başının partlayacağını hiss etdi və dayandı. Bir anlıq tərəddüd etdi və arxaya qanrıldı. Gənclər ətrafa fikir vermədən bayaqkı ehtirasla öpüşməklərində idilər. Köşkə sarı qaçmaq istəsə də, alınmadı. Başağrısı onu yerinə mıxlamışdı. Qamətini dikəldib yumşaq addımlarla üsulluca skamyaya doğru istiqamət aldı. Qız onu görən kimi dik atıldı. Həmin arada oğlana da dümsük vurmağı unutmadı. Oğlan da tez özünü düzəltdi. Nağıyev düz skamyanın yanında, gənclərlə üzbəüz dayanıb əlini gicgahına tutdu:

- Salam aleykum. Vəsiqələri, zəhmət olmasa.

Başağrısı eynən səhərki kimi, necə başlamışdısa, elə də səngidi. Elə bil bayaq ağrıdan partlamaq dərəcəsində olan baş onunku deyildi. Əlini uzadıb vəsiqələri aldı.

- Vətəndaş, ictimai asayişi kobud şəkildə pozduğunuz üçün cərimə olunursunuz…

Araya çox qısa sükut çökdü. Nağıyev qızarıb pörtsə də, alaqaranlıqda bunu heç kim görmədi.

- Axı… Axı qanunda belə bir şey yoxdur. Rəis… Üzrlü sayın, bir də olmaz. Keçin budəfəlik, – oğlan əllərini cütləşdirib kəkələyə-kəkələyə yalvardı.

Nağıyev duruxdu. İstədi ki, görməzdən gəlsin, vəsiqələri qaytarsın və xəbərdarlıq edib uzaqlaşsın. Düşündü ki, onsuz da heç nə məruzə etməyib, şöbədən də kiminsə xəbəri yoxdur. Bununla heç nə itirməz. Üstəlik, burada qanun pozuntusu sayıla biləcək nə var ki? Ən doğrusu, keçməkdir. Bu düşüncə ilə vəsiqələri oğlana tərəf uzadan kimi başağrısı qəfildən elə şiddətləndi ki, az qaldı, əlindəkiləri yerə salsın. Uzatdığı əlini sərt şəkildə geri çəkdi və səsini qaldırdı:

- Mənə qanun öyrədəcəksən, ə?! Ya cəriməni ödəyirsən, ya da maşına basıb bölməyə aparıram. Orada məşğul olarlar sizinlə. Cəld ol, işim-gücüm başımdan aşır!

Oğlanın rəngi ağardı. Tez əlini cibinə atıb əlli manat çıxardı, əsə-əsə Nağıyevə uzatdı. Nağıyev pulu aldı və cibinə dürtüb əli ilə ərkyana gəncin çiyninə vurdu:

- Bax belə! Gəncsiniz, eybi yox. Bu dəfə keçirəm, cərimə yazmıram sizə. Amma çalışın, bir də olmasın. Başqası olsa, keçməyəcək. Oldumu?

Gənclər tez başları ilə təsdiqlədilər. Nağıyev özündənrazı şəkildə qımışıb çöndü və köşkə tərəf addımladı. Yolüstü ayaq saxlayıb cibindəki spirt və kibrit qutusunu da çıxartdı və saymazyana şəkildə zibilqabına fırlatdı. Artıq onlara ehtiyacı olmadığını düşünürdü.

***

Axşam saat ona işləyirdi. Həzin yağış yağmağa başlamışdı. Var-gəl etməkdən yorulmuş Nağıyev blokun qabağında yerə çöməlib siqaret çəkə-çəkə gözləməkdə idi. Tez-tez saatına baxır, dodağının altında ağır söyüşlərlə gözlədiyi aktivistin nəsil-nəcabətini yad edirdi.

Saat onda kimsə blokun girişinə doğru addımlayanda çöməldiyi yerdən qalxıb ona yaxınlaşdı və şəxsiyyət vəsiqəsini istədi. Həmin adamın səhər adı verilmiş aktivistlərdən biri – İsmayıl Rüstəmov olduğunu görüb qollarını arxasına burdu, vəziyyət barədə şöbəyə məruzə etdi.

On dəqiqə sonra blokun qabağında iki polis maşını vardı. Üçüncü mərtəbədə, İsmayılın yaşadığı mənzildə axtarış aparılırdı.

Nağıyev evə qayıdanda gecə saat bir idi. Evdə heç kim yox idi, amma səhərki kimi, yenə bu paranormallığa önəm verməyib divana yayxandı. Əməllicə yorulmuşdu, bir az sonra qalxıb əl-üzünü yudu, fikirli-fikirli əynindəki formanın düymələrini açmağa başladı. Səhər bədəninə pərçimlənmiş formanı bu dəfə rahat soyundu. Amma nədənsə, buna təəccüblənmədi, paltarı səliqə ilə soyunub kreslonun üstünə sərdi. Elə bil səhər az qala yandırmaq istədiyi yox, hər gün geyinib-soyunduğu forma idi. Yerinə uzanmaq istəyəndə telefon zəngi sükutu pozdu. Gözucu nəzər salıb dostu Fərid olduğunu görüb bir anlıq fikrə getdi, bilmədi, götürsün, ya yox. Nə deyəcəyini də bilmirdi. Bir az gözlədi. Zəng səsi kəsildi. Nağıyev yerinə uzanıb yuxuya getdi.

***

Səhər tezdən ayılanda özünü çox gümrah hiss edirdi. Bir anlıq ötən gün baş verənlərin yuxu olduğunu düşünsə də, kreslonun üstündəki mundiri, ratsiya, dubinka və silahı görüb gülümsündü. Əlüstü yeməyini yedi, formanı da geyinib evdən çıxdı və şöbəyə yollandı.

Dünən bir xeyli adam saxlanmışdı. Amma aksiyanın əvvəldən təyin olunduğu vaxt və məkanda keçiriləcəyi ehtimalı qalırdı. Odur ki, bir neçə saat qabaqcadan Fəvvarələr Meydanı, Səməd Vurğun parkı və Əziz Əliyev küçəsinə gedən yollarda nəzarət postları qurulmuşdu. Nağıyev də Mərdanovun taboru ilə birgə Fəvvarələr Meydanına yollandı.

Günorta saat ikidən sonra Fəvvarələr Meydanı canlandı. Tut-hatut da bu canlanma ilə başladı. Yarım saat ərzində yüzə yaxın etirazçı tutuldu. Nağıyev aksiyada iştirak edib-etmədiyinə baxmadan qarşısına kim çıxdı, qollarını burub maşına basırdı. Gözləri elə qızmışdı ki, onu görənlərin canına vəlvələ düşürdü.

Aksiya, demək olar ki, dağıdılmışdı. Nağıyev nəfəsini dərmək üçün dayanıb ətrafa göz gəzdirdi. Bir neçə metr aralıda əlində etiraz plakatı olan arıq oğlan jurnalistlərə müsahibə verirdi. Oğlanı görən kimi vəhşi heyvantək nərildəyib ona tərəf cumdu. Plakatı alıb cırdı, oğlanın düz qulağının dibindən şapalaq ilişdirdi və qollarını burub maşına basdı. Maşında da söyə-söyə bir xeyli yumruqladı:

– Dayısının şeyini dişləyib çıxan qəhbə balası! Buna bax, pox boydadır, aksiya zad keçirir. Darıxma, mənim əlimdə qalacaqsan sən!

Yumruqlarının biri oğlanın gicgahına tutanda gənc özündən getdi, amma Nağıyev dayanmaq bilmirdi. Fəalın üst-başı qana boyananda işindən məmnun halda "Özünü çox yorma, bölmədə də xeyli işin olacaq" düşünüb zərbələrə son verdi.

***

Axşamüstü saat altı idi. Nağıyev sonuncu əzişdirdiyi etirazçının qoluna sıçramış qanını silə-silə dəmir qapını açıb içəri keçdi. Büzüşüb dizlərini qucaqlamış gənc onu görəndə diksinib ayağa qalxmağı ilə çənəsinin altından yumruq yeməyi bir oldu. Gənc səndələyib yerə sərilən kimi Nağıyev cibindən çıxardığı smartfonu onun üstünə tulladı:

– Aç bunu, özü də cəld ol! Yoxsa ananı gətizdirəcəm bura! Eşidirsən məni?!

Gənc təşviş içində bir üstünə atılmış smartfona, bir də Nağıyevə baxdı. Sarsıldığı üçün dili söz tutmadı, ya çox qorxduğundan, ya da şoka düşdüyündən ağlamağa başladı. Elə həmin an gözünün altına ilişdirilən ikinci yumruğun təsiri ilə başı divara dəydi.

- Nədir kod? – Nağıyev gəncin üstünə əyilib saçından tutdu – səninləyəm e, küçük! Kodu de!

Gənc özündə güc toplayıb zarıldadı:

- Bilmirəm, vallah bilmirəm…Haradayam mən? Nə olub? Xahiş edirəm döyməyin məni, qurban olum, döyməyin…

Nağıyev gəncin qarnına möhkəm təpik ilişdirib bağırdı. Bir neçə saniyəlik fasilədən sonra səsinə kinayəli ton verdi:

- Öz xoşunla demirsən ki?!

Gənc yerdə hərəkətsiz qalmışdı.

- Sən pidaraz adam dilində başa düşmədin. Demək ki, neynirik?

Verdiyi sual yenə havadan asılı qaldı.

- Demək, dalını dağıdırıq! – Öz sualına özü cavab verdi.

Gəncin şüuru keyidiyi üçün Deyilənləri dərk etməkdə çətinlik çəkdi. Başının ağrısı elə bir həddə gəlib çatmışdı ki, gücü yetsəydi, Nağıyevin əlindən çıxıb divara doğru sürünər və başını partlayana qədər daşa çırpardı.

Nağıyev şalvarının kəmərini açıb zəncirbəndini aşağı çəkdi. Gənc dəmir səsini eşidəndə dik atıldı və ixtiyarsız geri çevrildi. O isə iri əlləri ilə gəncin çiynindən tutub yerə yıxdı və üstünə çıxdı.

- Kod nədir? Axırıncı dəfə soruşuram! Onsuz vurmağa adam axtarırdım, yaxşı düşmüsən əlimə – şalvarını təmiz aşağı çəkdi və penisini çıxarıb əli ilə silkələməyə başladı. Gənc onun nəyə hazırlaşdığını hiss etdiyi üçün çığırdı:

- Bilmirəm, atamın canı bilmirəm! Eləmə, yalvarıram, eləmə!

Nağıyev deyilənləri eşitmirmiş kimi, gəncin şalvarını çəkib yenicə işə başlamışdı ki, boşluqdan çıxan hansısa əllər xirtdəyindən tutub geri dartdı. Heç nə görməsə də, müdafiə instinkti ilə bir neçə saniyə boşluğa yumruqlar yağdırdı. Bu əsnada başqa bir əl kürəyindən tutub beton döşəməyə yerə yıxdı, yerdə təpikləməyə başladı. Zərbələr altında ilan kimi qıvrılan Nağıyev həmin an ağlına gələn ilk şeyi etdi: imkan tapıb silahını çıxardı və boşluğa güllə atdı. İlk güllədəcə elə bil kürəyinə od basdılar. Gözləri qaraldı, kötük kimi yerə sərilib xırıldamağa başladı. Əynindəki polis forması qəfildən necəsə əriyib yoxa çıxdı və yerində sadə pijama peyda oldu. Təxminən bir dəqiqəyə yaxın qan içində xırıldaya-xırıldaya ora-bura çevrildi və qəfil ətrafa sükut çökdü. Onun təcavüz etdiyi gənc də bir neçə dəqiqə sonra aldığı zərbələrdən keçindi.

Səhər bütün xəbər saytları bu dəhşətli hadisədən yazırdı. İki nəfərin N saylı polis bölməsində faciəli ölümünün səbəbi heç kimə məlum deyildi. Ölkədə yeddidən yetmiş yeddiyə hər kəs günahı DİN-də görsə də, DİN özü də kələfin ucunu itirmişdi. Pijamalı kişi, haradan açıldığı bəlli olmayan atəş, tapılmayan güllə, öldürülən gəncin üzərindəki barmaq izləri – heç birinin məntiqli izahı yox idi…

İkinci hissə

## AĞ GÖYƏRÇİN

*Biz yenə də görüşəcəyik,*
*O yerdə ki, heykəllər*
*Böyük olmayacaq insanlardan.*
*O yerdə ki, haqq deyəni*
*Udmayacaq zindan.*
*O yerdə ki, sözünü deməkdən*
*Qorxmayacaqsan!*
*Polisin yanından keçəndə*
*Qorxmayacaqsan!*
*Hamı qatığa qara deyəndə*
*Sən ağ deməkdən*
*Qorxmayacaqsan!*
*Qorxmayacaqsan heç nədən!*
*Nə ata, nə ana, nə dövlət, nə Allah,*
*Heç birinə baş əyməyəcəksən!*
*O yerdə ki, ən dəyərli*
*Sən olacaqsan!*
*Tək dəyər*
*Sən olacaqsan!*

Gənclərin biri hər iki çiynində qutu ilə gəlib sevincək halda içindəki bülletenləri məhkəmə zalının döşəməsinə boşaltdı.

Bülletenlər döşəməyə dağılmaq əvəzinə göyərçinə dönüb zalda pərvaz etməyə başlayanda Tağının gözləri yavaş-yavaş qaraldı, qulağındakı cingilti də tədricən zəifləyib sonra tamamən kəsildi. O da ağ göyərçinə dönüb pəncərədən çölə uçdu və məhkəmə binasının damına qondu.

Gün batmaqda, göy qübbəsi isə tədricən tündləşən mavi-çəhrayı buludlarla çevrələnməkdə idi. Ağ göyərçin az sonra arasında süzüb ənginliyə qovuşacağı buludlara, bəlkə də, son dəfə aşağıdan baxdı və qanadlarını açıb göyə tutdu. Bu metamorfoza üçün Tanrıya minnətdarlıq edirmiş kimi…

***

…Soyuq dekabr günlərinin birində yayılan növbədənkənar prezident seçkilərinin keçirilməsi xəbəri çoxundan fərqli olaraq Tağını sevindirmişdi. O da bilirdi, bu seçkilərin gözlənilməz hər hansı bir nəticə doğurmayacağını, amma bu dönəmi özü üçün şans hesab edirdi. Adətən seçkilər ərəfəsində beynəlxalq təşkilatların diqqəti ölkəyə yönəldiyi üçün təzyiqlər səngiyirdi, iplər bir qədər boşalır və siyasi proseslərə maraq göstərən insanlar heç olmasa, bu qısa zaman kəsiyində faydalı işlər görə bilirdilər. Bəlkə də, bu, nihilistlərə və pessimistlərə olduqca mənasız görünür, amma bu işlərin sonrakı proseslərə verəcəyi töhfəni heç kim dana bilməzdi. Amma sən saydığını say, gör fələk nə sayır…

Həbslər və təqiblər səngimək əvəzinə daha da artdı. Bu elə bir həddə gəlib çatdı ki, seçkilərə bir neçə gün qalmış "əl-ayağa dolaşan" hamı aradan götürülmüş, meydan təmizlənmişdi. Amma bu belə Tağını qətiyyən ruhdan salmırdı. Bu seçki onun ilk tərcübəsi olacaqdı. İlk baxışdan çox ürəkbulandırıcı və mənasız təcrübə kimi görünsə də, bunun ona nələr verəcəyini Tağı çox gözəl dərk edirdi.

Günlərin birində indiyə kimi ancaq təlim və ictimai müzakirələrdə gördüyü Müzəffər adlı tanışından gələn gözlənilməz zəngin qarşıdakı aylarda baş verəcək hadisələrin istiqamətini dəyişəcəyini isə ağlının ucundan belə keçirmirdi. Seçkilərlə bağlı planının olduğunu deyən Müzəffər telefonda qeyri-müəyyən danışmış, bu gün, ən geci sabah mütləq görüşməli olduqlarını deyib dəstəyi asmışdı. Bu zəng Tağını həyəcanlandırmaq əvəzinə bir xeyli rahatlaşdırdı. Onsuz da heç vaxt ruhdan düşməmişdi. Amma indi tək deyildi, özü kimi ümidli və iş görməyə həvəsli biri vardı.

***

Görüşə, gözlədiyinin əksinə, Müzəffər tək yox, Haqverdi deyə təqdim etdiyi gənclə birlikdə gəldi. Haqverdi balacaboy, dolu bədənli, saqqallı və uzun saçlarını arxaya daramış təxminən iyirmi yaşında dəliqanlı idi. Çox güman ki, sol qolundakı oraq və çəkic döyməsi paltarın altında qalmasın deyə havanın soyuq olmasına baxmayaraq, qısaqollu köynəklə gəlmişdi. Haqverdini ilk dəfə görsə də, nəyə görəsə ipə-sapa yatmayan, ərköyün və eqoist tip olduğunu düşündü. Yəqin ki, Haqverdi onda bu düşüncəni, gecikdiyi üçün sonuncu gələn Tağı paba daxil olanda, Müzəffər ayağa durub onunla ikiəlli görüşdüyü halda, ayağa qalxmadan, sadəcə başını saymazyana yelləməklə və söhbət əsnasında səsləndirdiyi fikirlərlə yaratmışdı. Görüşün əvvəlindən sonuna qədər onunla birbaşa ünsiyyəti olmadı. Tez-tez rusca və ingiliscə jarqon kəlmələr işlədən, sözarası sifətini turşudaraq Azərbaycan xalqı (Haqverdi "aziklər" deyirdi) barədə aşağılayıcı tərzdə danışıb gileylənən bu gənci xoşlamamışdı. Şübhə etmirdi ki, ona da aşağı təbəqənin nümayəndəsi gözü ilə baxır, ümumiyyətlə, fərd olaraq ciddiyə almır.

Müzəffər özü də gödək və dolu olsa da, Haqverdidən fərqli olaraq qarayanız və mehriban idi. Göz bəbəklərinin üstünə sallanmış qalın qaşları, balaca qara gözləri və bir balaca qabağa gəlmiş iri çənəsindən "Hörümçək adam" filmindəki Doktor Oktopus rolunu canlandıran Alfred Molinaya bənzəyirdi. Öz etdiyi zarafatlara qəhqəhə ilə gülən bu məzəli adam seçkilərdən və öz planından danışanda niyəsə səsini qısıb az qala qaşlarının altında itən gözləri ilə ətrafı süzərək hər tamamladığı fikrin sonunda xaç çəkirdi. Bir neçə yerdə Tövratdan gətirdiyi əndrəbadi misalları Tağı anlamasa da, özünü o yerə qoymayıb başı ilə təsdiq edir, böyük entuziazmla planından danışan Müzəffərin qəribə əl hərəkətlərini və havada cızdığı müəmmalı sxemləri izləyirdi.

Əyləşən kimi, Tağıdan pivə içib-içmədiyini soruşdu. Tağı başını bulayınca ofisiantdan çay gətirməsini xahiş edib sözə başladı:

- Çox sağ ol, Tağı bəy, dəvətimi yerə salmayıb gəldin. Heyif, o biri uşaqlarda alınmadı, yoxsa hamımızın cəm görüşməyimiz, səni onlarla da tanış etməyim yerinə düşərdi. Eybi yox, növbəti dəfəyə, – üzünü Haqverdiyə çevirdi, – Mirzə Haqverdi də proseslərə marağı olan istedadlı və mübariz gəncdir, özü də yaxşı yazıçıdır, – Haqverdi başını yelləyib təkəbbürlə gülümsədi, Müzəffər əlini əlinə sürtüb davam etdi, – Bəy, sizi çoxdandır izləyirəm, yazılarınızı da bəyənirəm. Elə bayaqdan Mirzə Haqverdiyə sizdən danışıram. Sizin kimi həvəsli və maraqlı gəncləri bir araya gətirmək, zamanla qarşısıalınmaz gücə çevrilmək olar, – Müzəffər yan-yörəsinə boylanıb səsini qısdı, – düzdür, proseslər çox adamı ruhdan salıb, amma biz gərək ruhdan düşməyək. Ruhdan düşməsək və birləşsək, yaxşı işlər görəcəyik. Üstəlik, belə pis çıxmasın, ot kimi yaşamağın nə mənası var?, – qımışıb göz vurdu, – Düşündük ki, bizə qoşulmaq həm bizə, həm də sizə faydalı olar.

Müzəffər balaca gözləri ilə yenidən ətrafı süzdü, üzünü çevirib arxaya baxdı, o biri masalara göz gəzdirdi və səsini bir qədər də alçaltdı:

- Bilirsən də, bu il iki seçki baş tutacaq. Əsas məqsədimiz bu seçkilərdən maksimum istifadə edib faydalı işlər görmək, böyük bir müşahidəçi ordusu yaradıb artıq növbəti seçkilərdə hər məntəqəyə ən azı üç nəfər yerləşdirə bilməkdir. Bir güllə bahar olmaz. O qədər saxtakarlığın qarşısında bir nəfər həmişə gücsüz qalır. Üstəlik, unutma ki, böyük işlərin bünövrəsi belə kiçik kərpiclərlə qoyulur. Zamanı çatanda artıq meydan bizim olacaq. O zamana kimi isə biz dayanmamalıyıq… – Niyəsə duruxdu, Haqverdiyə nəzər salıb davam etdi. – Hələ ki cəmi on beş nəfərik, amma yaxın zamanda böyüyüb yüzə, minə çatmağı planlayırıq. Strategiyamızın adı "İşıq gələn tərəf", loqomuz isə budur, – ekranı çatlaq-çatlaq olmuş telefonunu Tağıya tərəf uzatdı, – o üç rəng bizim yolunu getdiyimiz Azərbaycançılıq xəttini ifadə edir…

- Bu faşistə qulaq asma, – Haqverdi siqaretini yandıra-yandıra söhbətə qarışdı, – o üç rəngi mırta qoymuşuq, hələ ki belə lazımdır deyə. Əslində, heç bir ideoloji mənası zadı yoxdur bizim üçün.

- Sənin ağlınla getsəydik, gərək, sovet bayrağı qoyaydıq…

- O da bir pox olmasa da, zato Tomsonun sizə soxuşdurduğu ala-bəzək parçadan yaxşıdır, – Haqverdi Tağıya göz vurub qımışaraq telefonunu götürdü və qurcalamağa başladı.

Müzəffər pərt olsa da, özünü o yerə qoymadı, yoldaşlarına çay süzüb sözünə davam etdi:

- Nə isə, bu dəqiqə qarşımızda duran əsas məsələ gizlilik və təhlükəsizlikdir. Bu dəlinin təklifləri ilə getsəydik, hamımız içəridə idik. Bunun nə mənası var? Boş aktivizm, başqa heç nə! – Müzəffər Haqverdinin üzündəki ifadənin dəyişdiyini görüb könlünü almaq üçün əlini yüngülcə onun çiyninə vurdu.

- Bəs bu təşkilatın strukturunu necə planla…

- Yox, a bəy, - bu sualı gözləyirmiş kimi, Müzəffər onun sözünü ağzında qoydu, - biz təşkilat deyilik! Üstəlik, siyasi təşkilat heç deyilik. Məqsədlərimiz…

- Yaxşı, mans, həyəcanlanma, bizim gerilla dəstələrinin intellektual uzantısı olan anarxo-kommunist təşkilat olduğumuzu Tağıya deməerəm, – Haqverdi bayaqkı tərzdə göz vurub qımışdı.

- Ala, qoy sözümü bitirim də… Hə, məqsədlərimiz çoxşaxəlidir. Təşkilat olsaq, özümüzü hədəfə çevirmiş olarıq. İndiki şəraitdə itkilərdən qaçmalı, əlimizdə olanları qorumalıyıq. Tələsən yerimiz də yoxdur, yaxşı işlər də yavaş-yavaş görülür. - Müzəffər səs tonunu bir az da alçaldıb az qala pıçıltı ilə davam etdi. - Bir ay sonra seçkidir. İlk işimiz gəncləri bir araya yığmaq, mobil bir şəbəkə yaratmaq, daha sonra onları müşahidəçi kimi müxtəlif məntəqələrə göndərməkdir. Hə, bilirik ki, bununla nəticələrə təsir edə bilməyəcəyik, amma əsas məqsədimiz bu deyil, növbəti seçkilərdir...

Müzəffər söhbətə ara verdi, yan masaya doğru gedib əyləşən ortayaşlı kişini şübhəli nəzərlərlə izlədi, sonra yenidən diqqəti onda olan Tağıya çevrildi.

– Pozuntuları sistemləşdirib hesabat formasına salaraq həm ölkə içində, həm də kənarda yayacağıq. Əvəzində həm buradakı, həm də xaricdəki mütərəqqi qüvvələrdən dəstək ala bilərik…

- Çox sadəlövhsən, mans. Ağ adamların heç vecinə deyilsən ey sən. Onların nə qozuna aziklər nətər yaşayır? – Haqverdi indicə stolun üstündə qoyduğu telefonunu yenidən əlinə aldı, sifətinə saymazyana görkəm verib onu qurdalamağa başladı.

- Bu bizim üçün çox önəmli, – Müzəffər tövrünü pozmadı, – onların dəstəyi həlledici deyil, amma ən azı bizi tanıyacaqlar, biləcəklər ki, belə bir təşəbbüs var. Üstəlik, seçki saxtakarlıqlarını işıqlandırıb hamıya göstərəcəyik ki, baxın, onlar ən güclü dönəmlərində belə, taxtı itirməkdən qorxurlar. Bu özü insanlarda bir ümid qığılcımı yaradacaq. Həm də, siyasi mübarizə təcrübəsi toplamaq, yeni-yeni insanları tanımaq, təşkilatlanmaq imkanıdır seçkilər... Ölkədəki bütün məntəqələrə müşahidəçi yerləşdirə bilmərik. Amma azı əlli-altmış nəfəri toplaya bilərik yəqin, hərəsini bir rayona göndərərik. Gələn həftə təlim keçirəcəyik, orada danışarıq ətraflı, – Müzəffər baxışları ilə qonşu masadakı kişini göstərib "Qalxaq yavaş-yavaş" tərzində başını yellədi və ofisiantı çağırıb hesab istədi.

- Vaxtı və məkanı deyəcəyəm. Birinci qeydiyyatdan keçib vəsiqə alın, sonra danışarıq detalları. Tağı bəy, siz də boşsunuzsa, söhbətimizə parkda davam edərdik.

Gənclər qalxıb söhbət edə-edə pabı tərk etdilər. Onlar çıxdıqdan bir neçə dəqiqə sonra Müzəffərin şübhəli baxışlarla süzdüyü yad adam əvvəlcə kiməsə zəng edib əli ilə ağzını tutaraq nəsə məruzə etdi, sonra ofisianta işarə etdi. Ofisiant gənclərin əyləşdiyi masadakı çaydanı götürüb kişiyə yaxınlaşdı, sonra ikisi də pabın bufetinin yanındakı kabinetə tərəf istiqamət aldı…

***

Seçkilərə üç gün qalmış köhnə yaşayış binasının birinci mərtəbəsindəki dar, yarıqaranlıq, rütubətli otaq adamla dolu idi. Adam sayına baxdıqda otaqda çox qəribə sakitlik hökm sürsə də, içəridəki mühit Tağının ürəyinə yatdı. Hələ təlimçi gəlməmişdi, heç Müzəffər və Haqverdi də gözə dəymirdi. Tamamilə fərqli görkəmdə, yaşda və əhval-ruhiyyədə olan bu insanları isə sanki fövqəltəbii qüvvə bir araya gətirmişdi. Səssizlik bir xeyli sürdü, həmin arada isə kəfkirli saatın çıqqıltısı və arabir gələn öskürək səslərindən başqa heç nə eşidilmirdi.

Nəhayət, sükutu otağın o biri başındakı uzun saçlı, keçisaqqal oğlan pozdu. Balalayka ilə ifa etdiyi xoş musiqiyə iki gənc durub rəqs etməyə başladı. Sonra daha iki nəfər cəsarətlənib ayağa qalxdı və onlara qoşuldu. Dar otaq boyunca qol-qola rəqs edən gənclərin sırası tədricən genişləndi və bayaq bir-birini tanımadıqları üçün ünsiyyətə belə cəhd etməyən insanlar digərlərini də rəqsə qoşulmaq üçün yerlərindən qaldırdılar. Oğlan ifasına ara verən kimi bayaq Tağının yanında əyləşmiş mavi saçlı qız adamı valeh edən soprano səsi ilə "Sevgili canan" qəzəlini oxumağa başladı. Qızın səsi içəridəkiləri elə cuşa gətirdi ki, ifanın sonunda hamı bir nəfər kimi ayağa qalxıb onu alqışladı. Yarıqaranlıq, cansıxıcı görüntüsü olan otaq on dəqiqənin içində sanki dəyişib böyük, işıqlı zala çevrilmişdi.

Hamının başı elə qarışmışdı ki, heç kim Müzəffərlə Haqverdinin qırmızı saçlı, eynəkli qadınla birgə otağa girməsinin fərqinə varmadı. Müzəffər adəti üzrə əli ilə qəribə hərəkətlər edə-edə stolun başına keçdi və boyunun balacalığını kompensasiya etmək üçün ayağının altına kətil qoyub boğazını arıtdı. Gözucu otağa nəzər salıb qolunu çırmaladı və sözə başladı:

- Gənclər, sizi burada gördüyüm üçün çox şadam. Niyə buradayıq, nə etmək istəyirik, planlarımız nələrdir, bu barədə hər birinizlə tək-tək danışmışıq. Bu gün isə "Necə?" sualına cavab tap-mağa çalışacağıq. Çoxunuz tanıyırsınız, amma mən yenə təqdim edim. Təlimçimiz seçki üzrə ekspert, həmçinin feminist fəal Mehparə Şəmilzadədir, – Mehparə eynəyini düzəldib gülümsədi, – bu gün əsas məsələyə fokuslanacağıq. Əvvəlcə bir sual verim, – Müzəffər yenidən boğazını uzadıb otağa nəzər saldı, – aramızda müşahidəçi vəsiqəsini almayan var?

Səs çıxmadı.

- Əla, o zaman başlaya bilərik. Mehparə xanım sizə məntəqədəki fəaliyyətinizi addım-addım izah edəcək. Qeydlərinizi götürün, zəhmət olmasa, nə sualınız olsa, çəkinmədən verin.

Mehparənin böyük həvəslə, lövhədə çəkdiyi qarışıq sxemlər və qəribə simvollarla izah etdiyi proses bir yerdən sonra Tağını yormağa başladı. Təlimin bu hissəsində deyilənlər Tağıya aydın idi, çünki əvvəllər də seçki müşahidəsi ilə maraqlanmışdı və bütün bunlar onun üçün yeni şeylər deyildi. Amma Mehparənin niyə bu qədər qəliz dilə müraciət etməsini anlaya bilmirdi. Tağı oturduğu yerdəcə yuxulamağa başlamışdı ki, Mehparə təntənəli şəkildə təlimin nəzəri hissəsinin yekunlaşdığını elan etdi.

- Əzizlərim, indi gələk digər məsələlərə. Müzəffər hər birinizə müəyyən qədər izah edib, bir də məndən eşidin. Gizliliyi maksimum qoruyun. Sizə yaxınlaşıb haradan gəldiyinizi, bir az da kobud şəkildə, kimin göndərdiyini soruşacaqlar. Cavabınız "Müstəqiləm, heç bir təşkilatla əlaqəm yoxdur", "Seçki prosesi mənə həmişə maraqlı olub, ona görə gəlmişəm" kimi olsun. Polis təzyiq edib telefonu əlinizdən ala bilər. Odur ki, yaxşı olar, mesaj qutusunu təmizləyəsiniz. Həmin gün nə siz bizi, nə də biz sizi tanımırıq, tamammı?

Stol ətrafında əyləşən gənclərin bir neçəsi başını təsdiqedici formada yellədi. Mehparə çevirilib Müzəffərə sualedici nəzərlərlə baxdı, Müzəffər qalın qaşları altında itmiş xırda gözlərini yumub başı ilə təsdiqlədi.

- Çox gözəl! Münaqişədən qaçın, bizə münaqişə lazım deyil. Çünki bu, heç nəyi dəyişməyəcək. Ara yerə məntəqəni əldən qaçıra bilərik, başqa heç nə. Unutmayın, biz seçki prosesinə müdaxilə etməyə yox, onu müşahidə etməyə gedirik…

- Mehparə, başlama da, qurban olum! Nə edək, əl-qolumuzu sallayıb gözümüzü döyək?! Əl çəkmədiniz də bu mötədilliyinizdən, – Haqverdi ayağa qalxıb üzünü stol ətrafında əyləşmiş iştirakçılara tutdu, – uşaqlar, Mehparəyə fikir verməyin, elə ki gördünüz, xalanın biri əlində topa bülletenlə gəlir, kameranı yandırıb qaçın üstünə, səsinizi qaldırın, qorxsunlar ikinci dəfə etməyə, bilsinlər ki, sizin yanınızda işləri çətindir.

- Polis gəlsə, nə edək? – kimsə soruşdu.

- Heç nə, onu da çəkin. Nə edəcək e, ala? Həbs etməyəcək ki. Uzaqbaşı məntəqədən kənarlaşdırarlar, bu da faciə deyil. Onsuz da prosesə təsir edə bilmirik, məntəqəni itirsək nə olacaq, itirməsək nə olacaq? Əsas olan oradakı saxtakarlıqla bağlı faktlardır, vəssalam.

Müzəffər coşmuş Haqverdinin qoluna girib stula əyləşdirdi. Nitqinə edilmiş müdaxilə Mehparənin heç xoşuna gəlməsə də, özünü o yerə qoymadı, bayaqkı sakit səs tonu ilə davam etdi:

- Gənclər, radikallıq lazım deyil. Biz heç nəyə dəqiq proqnoz verə bilmərik. Necə bir ölkədə yaşadığımız da hamımıza məlumdur. Radikal davranış təkcə məntəqəni itirməyimizə səbəb olmayacaq, bunu unutmayın. Adınız xüsusi xidmət orqanlarının siyahısına düşə bilər, sonra problem yaradarlar. Nəyə lazımdır? Məqsədimizin təkcə bu seçki ilə bitmədiyini unutmayaq və sayımızı, təhlükəsizliyimizi qoruyaq.

Haqverdi saymazyana şəkildə ayağa qalxıb otağı tərk etdi. Müzəffər də durub onun arxasınca getdi. Mehparə isə pərt olsa da, eynəyini düzəldib yenə əvvəlki qaydada davam etdi:

- Dostlar, işdir, polis sizi nəzarətə götürsə, çox yaxşı olar ki, izahat yazıb çıxasınız. İzahatda da, dediyim kimi, müstəqil müşahidəçi olduğunuzu, seçkilərə də sadəcə prosesi müşahidə etməkdə maraqlı olduğunuz üçün qatıldığınızı, seçki prosesinə heç bir şəkildə mane olmaq məqsədinizin olmadığını qeyd edin. İncitməzlər yəqin, buraxarlar. Amma bu, katastrofik haldır. Siz çox diqqət mərkəzinə düşməsəniz, səs-küy salmasanız, sizə ilişməzlər.

Müzəffər qayıdan kimi Mehparə yenidən sual dolu nəzərlərlə ona baxdı və cavabını alıb əyləşdi. Müzəffər stolun başına keçib həmişəki kimi boğazını arıtdı və sözə başladı:

- Dostlar, təlimimiz bu qədər. Sayımız gözlədiyimizdən az olduğu üçün bəzi rayonlara müşahidəçi göndərə bilməyəcəyik. Odur ki, əlli nəfər əlli rayon və şəhərə yollanacaq. Biz püşk atmışıq. Xahiş edirəm, növbə ilə yaxınlaşıb adınız qarşısındakı məntəqəni tapın və bir yerə qeyd edin. Ödənişi bir gün öncə edəcəyik. Yaxşı olar ki, elə həmin gün yola çıxasınız. Seçki günü səhər saat yeddidə məntəqədə olarsınız. Uğurlar hər birinizə!

Bir neçə nəfər düşdüyü məntəqəyə baxıb qeydlərini götürəndən sonra Tağının növbəsi çatdı. Doğma rayonu Kürdəmirdə olmağı çox istəsə də, püşk onu Lənkəran şəhərinə salmışdı. Lap əvvəldən düşmək istəmədiyi yerlər arasında Lənkəran da vardı, lakin bundan əvvəlki seçkiləri xatırlayanda macəraçı damarı tutdu. Məntəqənin adını görəndə isə ixtiyarsız gülümsündü. Onu bu məntəqənin yerləşdiyi məktəbə bağlayan bir şey vardı. O, Məleykənin bitirdiyi məktəbə ayaq basacaqdı, orada seçkiləri müşahidə edəcəkdi. Onun üçün bu pak varlığın ayaq basdığı hər yer dəyərli idi. Lakin bu dəfə o yerdə, bəlkə də, heç vaxt görmədiyi əxlaqsızlıqların şahidi olacaqdı, sevdiyinin balaca əllərindən tutub ona yazmaq öyrədən qabarlı əllərdə topa bülletenlər görəcəkdi, həmin məktəbdən də, onun saxtakar müəllimlərindən də, yerləşdiyi şəhərdən də, ölkədən də, hər şeydən iyrənəcəkdi. O, sevdiyi qızın on bir il oxuduğu, koridorlarında gəzdiyi, şəklinin divarını bəzədiyi məktəbin şeytan yuvasına çevrildiyini görmək istəmirdi…

***

Tağı başını maşının soyuq şüşəsinə dayayıb dinlədiyi musiqinin nəqarətini mızıldaya-mızıldaya mürgüləyirdi:

*"Ben bir ceviz ağacıyım Gülhane Parkında*

*Ne sen bunun farkındasın, ne de polis farkında…"*

Tədricən qapanan hərəkətsiz gözləri alatoranlıqda yolun kənarında düzülmüş qarapaltarlı keşikçilər kimi görünən şam ağaclarına dikilsə də, fikri göylərdə, çəhrayı buludlarda idi. Arasında süzdüyü buludlardan baxdıqda nəhəng ilana bənzər magistral yolla şütüyən avtomobildə mürgüləməkdə idi. Qarışqadan da balaca qalan və yavaş-yavaş kiçilən avtomobilə sarı gülümsəyərək başını buladı və Bakıya tərəf istiqamət aldı.

İşıqlı meqapolisin səmasına çatdığını hiss edəndə dayandı, buludlardan enib ayaqları altında xalça kimi sərilən şəhərə göz gəzdirdi və çox düşünmədən Hüseyn Cavid parkına endi. Ağacların birinin arxasında gizlənib beş metr o tərəfdə qızğın mübahisə edən iki nəfəri izləməyə başladı. Mübahisə edən tərəflər özü və Məleykə idi. O qədər gərgin idilər ki, ətrafda onlara təəccüblə tamaşa edən insanları görmürdülər. Qışqıra-qışqıra, əsəbi əl-qol hərəkətləri ilə qarşısındakına nəsə izah eləməyə çalışırdılar. Axırda Tağı mübahisəni kəsib etinasız şəkildə telefonu ilə oynamağa başladı. Bu, Məleykəni cin atına mindirdi, əlindəki kağızı cırıb oradan uzaqlaşdı. Kağız parçaları yerə düşməmiş, elə havadaca ağ göyərçinə çevrilib pərvaz etdi, Məleykənin arxasınca götürülən Tağı bunu görmədi. Göyərçin uçub ağacın arxasında gizlənən o biri Tağının çiyninə qondu. Ardınca ikisi də buludlara yüksəldilər…

Mavi-çəhrayı buludlara çatmağa az qalmışdı ki, kobud, çat-çat olmuş və mazutun qaraltdığı nəhəng əl buludları yarıb Tağının çiyinlərindən tutdu və onu silkələməyə başladı. Ayılanda sürücünü və digər sərnişinləri başı üstündə görüb diksindi. Sürücü çiyinlərindən tutub onu silkələyirdi:

- Qağa, ayıl, maşın xarab olub.

- Haradır bura? – Hələ də gördüyü yuxunun təsirində olan Tağı gözünü ovuşdura-ovuşdura soruşdu.

Havadakı duman yolda qalmış maşının faralarından çıxan işıq selində göydən asılmış mistik pərdə kimi görünürdü.

- Lənkərandayıq, amma hələ şəhərə var. Ürgə kəndidir, – sürücü başını qaşıya-qaşıya deyindi, – bu andıra qalmışı dünən ustaya göstərmişdim. Tfu!

- İndi nə edəcəyik?

- Heç zad. Görüm düzəldə bilirəmmi. Düzəldə bilməsəm, taksi sifariş verərsiniz, onsuz beş-altı kilometr qalıb.

Sürücü kapotu açıb əlləşməyə başladı. Elə bu əsnada yolun o başından qoyun mələrtiləri gəldi. Cəmi beş dəqiqə sonra yolda qalmış avtomobil qoyun dənizinin tən ortasında idi. Tağıya bir anlıq elə gəldi ki, bu sayı-hesabı görünməyən sürünü adi insan yox, fövqəltəbii qüvvə idarə edir.

Axır ki, sürünün geridə qalmış, ayağını sürüyə-sürüyə özünü qarşıdakılara çatdırmağa can atan sonuncu üzvü də avtomobilin yanından keçib getdi və asta addımlarla maşına tərəf gələn yaşlı bir çoban göründü. Onlara yetincə sürücü ilə əl verib görüşdü, o biri sərnişinləri də başı ilə salamladı.

- Nolub, ay Akif? Göstərməmişdin bəs ustaya?

Akif cibindən dəsmal çıxarıb alnının tərini silə-silə dərindən ah çəkdi:

- Hacı, vallah, baş aça bilmirəm. Dünən baxmışdı, demişdi nasazlıq yoxdur.

- Uşaqlara deyim, gəlsinlər kömək eləsinlər də. Dərd eləmə! – Üzünü sərnişinlərə çevirib soruşdu: – Qaqaşlar şəhərə gedir?

Hər üç sərnişin başları ilə təsdiqlədi.

- Lənkəran adamısız, qağalar?

İkisi təsdiqlədi, Tağı isə kürdəmirli olduğunu dedi.

- Qalmağa yerin varmı? – Çoban Tağıdan soruşdu.

- Yox… yəqin oteldə qalaram.

- Oteldə nöş qalırsan? Ölməmişik ki, – çoban sürücüyə göz vurub güldü, – bu gecə qonağımsan.

- Çox sağ olun, əmi, sizə əziyyət verməyim, – Tağı əlini sinəsinə qaldırıb minnətdarlığını göstərdi.

- Əşi, nə əziyyəti?! Allah qonağısan. Elə şey olarmı ki, yolun buralardan keçə, özün də qərib olasan, amma Hacı Rüstəm səni qonaq eləməyə?, – çoban əlini Tağının çiyninə vurub güldü, – Veşvüşün varmı?

- Yox, əmi, təkcə bu çantadır.

- Onda gəl getdik, – üzünü Akifə tutdu, – indi yığıram Sadiqgilə, gələcəklər, narahat olma. Başqa qulluğum?

- Canının sağlığı, Hacı..

Əl sıxışıb ayrıldılar.

Hacı Rüstəmin yaşı altmışı çoxdan haqlasa da, hündür boyuna, dik belinə, enli kürəyinə, şəvə kimi qara bığlarına baxan qırxdan çox verməzdi. Sümükləri çıxmış, qırış-qırış olmuş əllərinin və gündən qaralmış sifətinin balaca şırımlarında illərin əzab-əziyyəti gizlənmişdi. Əsl zəhmətkeş kənd adamı idi çuxura düşmüş gözlərində həyat eşqi qaynayan Hacı Rüstəm.

Yol uzunu heç bir işıq dirəyinin olmadığı qaranlıq, ara-sıra balaca kol topalarının ayaqlarına ilişdiyi düzən boyunca gün-güzəranından, ailəsindən, başına gələn maraqlı əhvalatlardan tutmuş gəncliyinə və ilk sevgisinə kimi, acı-şirin xatirələrini bölüşən Hacı Rüstəm qonağın gözlərindəki marağı görüb daha da həvəslənirdi. Evi yoldan iki kilometrlik piyada məsafədə yerləşdiyi üçün söhbətləri də uzun və maraqlı keçdi.

- Sən danış e indi, qağa. Xeyirdi buralara gəlişin? – Hacı Rüstəm qoyunları ağıla salıb qapını bağlaya-bağlaya soruşdu.

- Sabahın seçkilərində müşahidəçiyəm.

- O nəmənə şeydir elə? – Çoban dikəlib qaşlarını düyünlədi, – birinci səfərdir belə şey eşidirəm.

- Prezident seçkilərini müşahidə edəcəyəm. Prosesə nəzarət kimi bir şey.

- Həə, belə dee, – çoban başını yellədi, son dediyini daha iki dəfə dodağının altında təkrarlayıb fikirli-fikirli soruşdu – Hökumət yollayıb səni?

- Yox, əmi, özüm müstəqil şəkildə gəlmişəm. Həmişə maraqlı gəlib mənə, dedim bir dəfə də özüm iştirak edim.

- Həə, lap yaxşı, ay qağa, Allah köməyin olsun.

Hacı Rüstəmlə Tağı evə doğru istiqamət aldılar. Bir neçə addım atmışdılar ki, çoban yenidən dilə gəldi:

- Orada neyniyəssən? Sən də səs verəssən?

- Yox, əmi, səs verməyəcəm, səsvermənin şəffaflığına, yəni doğruluğuna nəzarət edəcəm, qeydlər götürəcəm.

- Belədə, özün kimi dəstəkləyirsən? – Bir neçə saniyəlik aradan sonra çoban soruşdu.

Tağı çobanın verdiyi son suallardan əməllicə karıxsa da, bunu büruzə veməməyə çalışdı:

- Heç kimi… – Cavab qısa oldu, bununla həm də bu mövzuda müzakirənin ürəyincə olmadığını çobana hiss etdirmək istəyirdi.

Çoban da bunu duyub söhbəti dəyişdi, yenə qoyunları güdərkən başına gələn maraqlı əhvalatlardan, sovet dövründə qurduğu xırda biznesdən, ailəsindən, uşaqlarından danışmağa başladı.

Hacı Rüstəm üç qız, bir oğul atası idi. Qızlarının üçünü də Bakıya ərə vermişdi, oğlu Sadiq isə maşını xarab olmuş Akifə köməyə yollanmışdı deyə, arvadı Şövkət evdə tək idi. Çatan kimi süfrə salan qadın ərindən fərqli olaraq, zamana daha tez təslim olmuşdu. Beli bükülmüş qarı axsaya-axsaya samovar çayı qaynatdı, süfrəyə müxtəlif süd məhsulları və təndir çörəyi qoyub özü bir küncdə oturdu.

- Nuş elə, ay oğul, yol gəlibsən, indi durub yerini də salaram, yatarsan.

Hacı Rüstəm yapıncısını çıxarıb süfrə başında əyləşdi. Qollarını çırmalayıb çörəyi iki yerə böldü, pendirdən kəsib arasına yaxdı və Tağıya sarı uzatdı:

- Ayə, bu şəhər uşaqları nə dəymədüşər olur! Bas ye də, quruyub ikilik taxtaya dönmüsən. Pahoo!

Bayaq otağa girəndə üzbəüz divardakı Elçibəyin portreti qonağın diqqətini çəkmişdi, həmin detalı, söhbət düşəndə çobandan soruşmaq üçün yaddaşına yazmışdı. Çörəyi götürüb yeyə-yeyə:

- Əmi, bayaq divarda bəyin rəsmini gördüm. Maraqlı gəldi, dedim soruşum sizdən: bu kişiyə sevginizin kökü nəyə bağlanır?

Hacı Rüstəm bığaltı gülümsəyib cavab verdi:

- Əcəb edirsən soruşursan, qağa. Bayaq deyəcəkdim, gördüm nəsə xoşuna gəlmədi, day mən də söhbəti dəyişdim, – çayından iki qurtum içib sözünə davam etdi, – əmin o vaxtlar, xalq hərəkatı dövründə raykom katibi idi. Elə ki, hərəkat alovlandı, biz də başladıq kənd camaatı arasında təbliğata. Məni işdən qovdular, getdim Bakıya. Rəhmətliklə də elə o dönəm tanış olduq. 92-ci ildə hakimiyyətə gələndən sonra məni də qoydular Lənkəranın icra başçısının müavini. Nə başını ağrıdım, hökumət dəyişən kimi işimi də itirdim. Köhnə cəbhəçi olduğum üçün, üstəgəl yaltaqlığı bacarmadığıma görə heç yerdə iş tapa bilmədim. Jiqulimi dəyərdəyməzə satıb on dənə qoyun aldım, düşdüm dağlara. Pox-püsürə bulaşmadım, heç kimin qabağında əyilmədim, ona görə alnım açıq, dilim də uzundur hər yerdə. Maşallah, evim, arvad-uşağım, qoyunlarım, başqa nə lazımdır adama?

Gülümsünüb çayından daha iki-üç qurtum içdi və davam etdi:

- Elçibəy mənim üçün təmizliyin, paklığın simvoludur. Əsl xalq adamı idi. Allah qəni-qəni rəhmət eləsin, məkanı cənnət olsun. Heç vaxt xalqın malında, mülkündə gözü olmayıb. Heyif, camaat belələrinin qədrini bilmir, – bir az irəli əyilib səs tonunu dəyişdi, – "Aldanmış kəvakib"i oxumusan?

- Hə, məktəb vaxtı oxumuşam.

- Bax, eynən oradakı kimidir bizim halımız. Bir az üzüyumşaq, fağır, saf adam başa çıxsa, onu elə bu camaat vurub salacaq aşağı. Yusif Sərracları bəyənmir bu millət, gözü götürmür elələrini. İndikilər minir camaatı, gör səsləri çıxır? Çıxmaz da! Sabah yenə elliklə gedib səsini onlara verəcəklər….

- Yox, əmi, razı deyiləm səninlə, – gənc etiraz olaraq başını buladı, – səni əmin edirəm ki, çoxluq bu durumdan razı deyil. Sadəcə, lider yoxdur ortada, çıxsın desin ki, ay camaat, arxamca gəlin. Azərbaycan xalqı otuz ildir yetimdir, başsız qalıb ortalıqda. Özünə lider deyib xalqı quru yurdda buraxanlara görə bu gündəyik, xalq da haqlı olaraq heç kimə bel bağlamır.

Ev sahibi sınayıcı nəzərlərini qonağın gözlərinə dikdi:

- Guya lider çıxsa, nə dəyişəcək? Sənin xalqın düşəcək onun arxasınca? Gözlə! – Çörəkdən bir dişləm qoparıb çeynəyə-çeynəyə davam etdi: – Hələ gəncsən, qanın qaynayır, hər şeyi çəhrayı rəngdə görürsən. Gürcüstanın prezidenti indi haradadır, bilirsən?

Tağı başı ilə təsdiq etdi.

- Görürsənmi? Hanı gürcü xalqı? Haray oldu ona?

- Əmi, axı Azərbaycandakı siyasi idarəçiliklə Gürcüstanınkı eyni deyil, - qonaq söz altında qalmadı, - Gürcüstan üzünü Avropaya tutub, istər insan azadlığı, istər korrupsiya ilə mübarizə sahəsində bizdən xeyli öndədir. Bunları nədənsə nəzərə almırıq. Hər iki ölkədə lider potensiallı insanlar çoxdur. Sadəcə, fərq bundadır ki, orada bu potensialı üzə çıxarmağa imkan verən mühit var, bizdə isə yox, başını qaldıranı beşikdəcə boğurlar.

Ev sahibi qalxıb həm özünə, həm də qonağa çay süzüb yerinə qayıtdı:

- Biz qılınc müsəlmanıyıq e, qağa, bunu da yaddan çıxarma. Səni əmin edirəm, ipləri tam boşaltsalar, sən deyən kimi, şəffaf seçki keçirsələr, camaat gedib yenə padşaha səs verəcək… – Çayını birnəfəsə içib söhbəti dəyişdi: – Sabah saat neçədə çıxassan?

- Tezdən, gərək 7 üçün məntəqədə olum. Bir saat qabağa taksi gəlsə, çataram yəqin.

- Həə… saat 10-dur, get yat ki, səhər dura biləsən. Yatıb qalsan, yaxşı düşməz, – Hacı Rüstəm gülüb əlini Tağının çiyninə vurdu, – mən də gedirəm yatmağa. Nəsə sözün olsa, çəkinmə, gecənin istənilən vaxtı oyat.

Qonaq minnətdarlıq edib ayağa qalxdı. Evin sahibəsi onun yerini çoxdan salmışdı. Həm tezdən dura bilmək, həm də yatmağa hazırlaşan qocaları narahat etməmək üçün gedib yerinə uzandı və yuxuya getməyə çalışdı. Onu çətin gün gözləyirdi…

***

Gecənin bir aləmində telefon zənginin səsinə oyandı. Zəng gələn nömrəyə belə baxmadan açdı.

- Alo, Tağı, necəsən? – Təlaşlı səs Müzəffərin idi.

- Yaxşıyam. Nolub bu vaxtı?..

Sözünü bitirməyə macal tapmadı.

- Təcili oyan, qrupu və mənimlə söhbətləri sil. Haqverdini oğurlayıblar, axşamdan bəri ona zəng çatmır. İndi də mənim arxamca düşüblər… – Nəfəsini dərib öskürdü: – Evdən çıxan kimi döngədə göründülər. İki nəfərdilər.

- Telefonu söndürmə. İndi hardasan?

- Dayanacağa gedirəm… İçinə azarım, işıqlı yerə çıxa bilsəydim…

- O biri uşaqlardan nə xəbər?

- İnanırsan, heç imkan olmayıb öyrənməyə. Sən özünü qoru, çalış hədəfə düşməyəsən.

- Məndən narahat olma… Çatdın dayanacağa?

- Ala, bunlar addımlarını yeyinlədirlər…

- Sən də yeyinlət, nə qədər məsafə var aranızda?

- Blin…

- Noldu? Müzəffər!… Eyyy!

Uzun xışıltı səsinin ardınca telefon söndürüldü. Tağı tez yenidən yığsa da, götürən olmadı. Üçüncü zəngdə operatorun səsi telefonun söndürüldüyü və ya əhatə dairəsi xaricində olduğu xəbərini verdi.

Görünür, əməliyyat başlamışdı. Bu barədə çox baş sındırmadan ayağa qalxdı, yerini yığıb zala keçdi.

Hacı Rüstəm daha erkən qalxıb qoyunları örüşə aparmışdı. Şövkət axsaya-axsaya çay qoyub süfrəni saldı. Yavaş-yavaş təbiətə məğlub olsa da, bu heysiz qarının dilindən dua əskik olmurdu.

- Allah səni bəd nəzərdən, nəfisdən, pis niyyətdən qorusun, ay oğul. Dua eləmişəm namazda, inşallah yaxşı olacaq!

Tağı həyətə çıxanda hava tünd-göy rəngdə idi, şaxta isə adamın iliyinə işləyirdi. İtlər Tağını görən kimi ona tərəf qaçmağa və hürüşməyə başladı. Özünü itirməyib telefonun işığını itlərə tərəf tutdu.

“Lanqı itlərdir, çəpəri keçib gəliblər, qorxma” deyib əlindəki çomaqla yardıma yetişən ev sahibəsi ilə sağollaşdı, taksi sifariş verdi, son dəfə bütün sənədlərinin yerində olduğunu yoxlayıb məhləyə çıxdı. Tağı maşına minəndə Şövkət əlindəki bir bardaq suyu arxasınca səpdi, ardınca dualarını da əksik eləmədi.

***

Tağı məktəbin darvazasına çatanda polis əməkdaşı ağzını ratsiyaya tutub nəsə məruzə edə-edə yaxınlaşdı:

- Kim lazımdı sənə?

Tağı özünü itirmədi, cibindən müşahidəçi vəsiqəsini çıxarıb polisə uzatdı:

- Müşahidəçiyəm.

- Hansı təşkilatdan göndəriblər? – Polis vəsiqəni o tərəf, bu tərəf çevirib baxa-baxa soruşdu.

- Müstəqiləm, heç bir təşkilatı təmsil etmirəm.

- Müstəqilsən? – Polis kinayə ilə qımışdı, – indi aydınlaşdırarıq, şəxsiyyət vəsiqəni bəri ver görüm.

Tağı sənədi ona uzatdı, polis telefonu ilə şəklini çəkəndən sonra ratsiyanı ağzına yaxınlaşdırdı:

- «Он из независимых. Буду держать в контроле».[1] – deyə rusca kimsəsə məruzə etdi, daha sonra yenidən üzünü Tağıya çevirdi: - Çalış çox o yan-bu yan eləmə. Keçə bilərsən...

Məntəqədə qələbəlik idi. Sübh tezdən olsa da, məktəbin qarşısında iynə atsaydın, yerə düşməzdi.

---

[1]“Müstəqillərdəndir. Nəzarətdə saxlayacam.” (rus)

Tağı insan dənizini yarıb özünü birtəhər içəri sala bildi. Onu görən kimi keçəl, hündürboy, təxminən əlli yaşlı və Fantomasa oxşayan məntəqə sədri yanındakı nisbətən gödək, ortayaşlı kişinin qulağına nəsə pıçıldadı. Həmin adam başı ilə deyiləni təsdiqləyib yerindən qalxdı və Tağıya yaxınlaşdı.

- Müəllim, vəsiqənizi olar?

Tağı vəsiqəni ona uzatdı və fürsətdən yararlanıb boynundakı vəsiqədə yazılanları oxudu: Sadiq Əzimov, müşahidəçi, YAP.

- Hansı təşkilatı təmsil edirsiniz? – Sadiq soruşdu.

- Orda yazılıb axı, müstəqil müşahidəçiyəm… Yəni heç kimi təmsil etmirəm.

Sadiq başını yelləyib baxışlarını qutuların əks tərəfində, divarın düz yanındakı uzun stolun ətrafında sıra ilə əyləşmiş qadınlara tərəf yönəltdi:

- Müəllim, zəhmət olmasa, gedin əyləşin orada. Oradakı xanımlar da seçkini müşahidə edirlər, – şəhadət barmağı ilə küncdəki qara stulu göstərdi, – elə o boş stulda əyləşin.

Tağı əvvəlcə, çənəsi qızışmış, stolun üstünə tum çırtlayan, yüksək səslə gülən, qışqıra-qışqıra nəyisə qarşı tərəfə cidd-cəhdlə izah etməyə çalışan qadınlara baxdı, sonra Sadiqə. Seçicilər qutuların önünü kəsmişdilər deyə, deyilən yerdən nəinki qutular, heç komissiya üzvlərinin əyləşdiyi masa da görünmürdü.

- Mən ayaq üstdə qalmaq istəyirəm. Oradan heç nə görünmür.

Sadiq qaşlarını düyünləyib diqqətlə Tağını süzdü:

- Başa düşmədim, müəllim, siz o biri müşahidəçilərdən artıqsınız?

Tağı mümkün qədər gərginliyi azaltmağa çalışıb gülümsədi:

- Məncə, siz də artıq deyilsiniz, – gözləri ilə onun müşahidəçi vəsiqəsini göstərdi.

- Mən hakim partiyanı təmsil edirəm, – cavabını verən Sadiq sağ əlini stula tərəf yönəltdi, – seçki prosesinə mane olmayın, əyləşin orada.

- Müəllim, bu dəqiqə seçki prosesinə zidd hərəkətlər edən sizsiniz. Qanunvericilik müşahidəçinin hərəkət dairəsini məhdudlaşdırmır. İstəsəniz, açıb baxa bilərik…

Sadiq istehza ilə gülüb əlini-əlinə vurdu:

- A kişi, bu ölkədə qanun bilirsən də kimdir?! Otur yerində, sakitcə müşahidə elə, yoxsa polis çağıracam!

Məntəqə sədrinin uzaqdan əli ilə işarə etdiyini görən yerli müşahidəçi Bakıdan gələn həmkarını buraxıb ona yaxınlaşdı, əlini ağzına tutub qulağına nəsə pıçıldadı, sonra yeyin addımlarla axın-axın gələn seçicilərə tərəf yönəldi.

Ayaqüstə belə qutuları görmək mümkünsüz idi deyə, Tağı göstərilən yerdə əyləşdi. O içəri girəndən dayanmadan söhbət edən və seçiciyə oxşamayan bir qrup qadın qutuları mühasirəyə almışdı. Onlardan biri hərdən Bakıdan gələn müşahidəçini süzüb yanındakılara nəsə deyirdi; onlar da divardakı rəsmi göstərib mənalı-mənalı başlarını yelləyirdi.

Tağı qəfildən həmin qadınların da, onunla yanaşı stolda əyləşən müşahidəçilərin də bir-birinə bənzədiyinin fərqinə vardı. Hətta ona elə gəldi ki, burada olan hər kəsin üzündə maska var və tərpənib düşməsin deyə, onları yapışqanla sifətlərinə bərkidiblər. Fantomasın da, Sadiqin də, yanında laqqırtı vuran müşahidəçilərin də, qutuların başını kəsdirən müəllimlərin üzündə hiss, emosiya deyilən şey yox idi. Tağı bu fikirlərin təsiri altında başını əlləri arasına alıb stola çökdü.

Bu əsnada qulağı yanındakı qadın müşahidəçinin həyəcanla dediyi sözləri tutdu:

- Bu nə oyundur düşmüşük?! Bəs demişdilər yüzbaşıyıq. O qədər əzab-əziyyətlə yığ milləti, səhər desinlər ki, müşahidəçisən. Sizə nəsə dedilər, Nüşabə?

- Elədi, ay Sədaqət, səhər bu vəsiqəni mənə verəndə dedilər ki, müşahidəçisən, – qadın gileyləndi, – iki yüz manat verəcəkdilər, onu da çox gördülər. Burunlarından gəlsin! Nə itim azıb burada?!

Tağı ehtiyatla telefonunu yandırıb səsyazanı açdı, sonra başını qaldırıb yanındakı müşahidəçiyə baxdı. Təxmini altmış yaşlarındakı "müşahidəçi"nin kağız kimi ağappaq üzü qəzəbdən əyilmiş, sifətinə sürtdüyü makiyajın üzərində balaca yarğanlar yaranmışdı. Hərəkət edib danışmasaydı, daha çox, əcaib kukladan fərqlənməyəcək bu qarının dümağ siması onu ürkütdü.

- Müəllim, olar bir sual verim? – Tağı ehtiyatla soruşdu.

Müəllimin simasındakı qəzəb qəfildən yoxa çıxdı, çöhrəsinə qonan təbəssüm sifətindəki çatların sayını daha da artırdı və onu daha qorxunc hala gətirdi.

- Buyur, oğlum, əlbəttə.

- Sizə yüzbaşı olmağınızla bağlı zəng haçan gəlmişdi?

Müəllim səsini qısıb cavab verdi:

- İyirmi gün olar, icradan zəng etdilər ki, yüzbaşısan.

- Təklif etdilər? – Tağı sifətinə süni maraq verdi.

- Yox, elə dedilər yüzbaşısan, adam yığmağa başla.

- Yığa bildiniz?

- Yığa bildim, amma heyif əziyyətimə, kaş yığmazdım, – qadın təəssüflə başını buladı.

- Əvvəllər də belə bir təcrübəniz olub? – Tağı bir qədər fasilə verib soruşdu.

- Hə, hə, olub. Bundan əvvəlki seçkilərdə minbaşı da olmuşam, – qarı qürurla cavab verdi, – Neyləyək, a bala, çörəyimiz bundan çıxır.

Üzünü çevirib yanındakı müşahidəçinin qulağına nəsə pıçıldadı. Nə dediyi Tağını elə də maraqlandırmadı, səsyazanı söndürüb telefonu cibinə qoydu. Bir neçə dəqiqəlik aradan sonra qadın yenidən Tağıya tərəf çöndü:

- Sənə də zəng etmişdilər?

- Hə, amma mən yarıtmadım onları, – Tağı gülümsündü.

Fantomas bayaqdan Tağıya göz qoyur, az qala, hər bir hərəkətini izləyirdi. Qutunun ətrafına toplaşmış qadınlar kimini ərə verir, başqa birini boşayır, filankəsi qaçırır, bəhmənkəsin evinə elçi gedirdilər. Stolun ətrafında əyləşmiş müşahidəçilər zaman keçdikcə daha yüksək səslə danışır, daha bərkdən gülürdülər. Topa-topa gələn insan seli komissiya üzvlərinin əyləşdiyi masanı görünməz etmişdi. Qutular olan ərazi isə, sözün əsl mənasında, işğal olunmuşdu. İçəri girəndən bəri Tağıya onları görmək imkanı verilməmişdi. Bir ara ona elə gəldi ki, heç orada qutu da yoxdur, seçicilər bülletenləri qadınlara təhvil verib çıxırlar.

Elə bu vaxt həmin qadınlardan biri söhbətdən ayrılıb səsvermə kabinəsinə doğru addımladı. Bu şübhəli davranış diqqətindən yayınmayan Tağı tez telefonunu çıxarıb kamerasını kabinəyə tuşladı. Bunu görən kimi Fantomas iri addımlarla ona yaxınlaşdı:

- Eyy̱, çəkiliş olmaz!

- Necə yəni olmaz? Bu, qanunla qadağan olunmayıb axı.

- Dedim axı, olmaz! Bizə elə göstəriş gəlib. Söndür telefonu!.. – Fantomas əli ilə Tağının telefon tutan əlini aşağıya elə itələdi ki, az qalsın telefon yerə düşəcəkdi.

- Mənim işim müşahidə etmək, pozuntu görsəm, çəkməkdir, mane olmayın! – Tağı telefonun kamerasını kabinetdən topa bülletenlə çıxan qadına tuşlamaq istəyəndə polis məntəqəyə daxil oldu. Amma buna məhəl qoymayıb qışqırdı: – Topa bülleten! Olmaz elə, bu, qanunsuzluqdur, imkan verin çəkim!

- Dedim sənə mumla, qaxıl yerində! – Fantomas Tağının qolundan tutub geriyə itələdi: – Sənin işin içinə soxub müşahidə eləməkdir, şüvənlik eləmək yox!

- Yenə kimdir səs-küy salan? – Özündənrazı addımlarla bir-birinə girmiş bu iki nəfərə yaxınlaşan polis Fantomasa müraciətlə soruşdu, – bu cavan oğlan qanun saymır, deyəsən?

- Rəis, bayaqdan yerində dayanmır, neçə dəfə xəbərdarlıq etmişik seçki prosesinə mane olmasın, elə bildiyini edir, – Sadiq haradansa peyda olub çuğulladı, – özü də deyirəm, polis çağıracam, gülür, deyir polis kimdir ki, məni onunla qorxudursan? Beləsinə nə deyəsən?!

- Dubinka yeməyib də indiyə kimi, ona görə yekə-yekə danışır. Atasan cibinə nəşəni, basasan içəri, ağlı başına gələ, bilə ki, özündən böyüklərin yanında necə davranmaq lazımdır, – ortalıqda gəzən müəllimlərdən biri söhbətə qoşuldu.

- Sən həyasıza bax! Belələrinə görə arvad-uşaq küçəyə çıxa bilmir! – Topa bülleteni yenicə qutuya atıb missiyasını uğurla yerinə yetirmiş qadın əsəbi tonla fikir bildirdi.

- Rəis, hələ bayaq mənə dediklərini eşitsəydiniz, əliniz üzünüzdə qalardı! Ailə tərbiyəsi görməmiş adam nə bilsin dövlət nədir, dövlətçilik nədir?! Bayaqdan oturub gəlib-gedəni çəkir, yollayır onu bura göndərənlərə! – Tağının yanında əyləşmiş ağappaq simalı qarı deyindi.

- Bu ki təxribatdır! Dərsini vermək lazımdır! – Kimsə həyəcanlı səs tonu ilə qışqırdı.

Polis Tağıya yaxınlaşıb üstünü yoxladı, əlini ciblərinə salıb-çıxardı, telefonunu alıb qolundan tutdu:

- Balaca, sənin o sərçə götünü dağıtmamış əyləş burada, sakitcə müşahidə et. Bax, bir də səndən şikayət eşitsəm, başqa cür davranacam. Dedim mən sözümü. Özünü yaxşı apar!

- Bəs mənim telefo… - Tağı cümləni bitirməyə macal tapmamış polis onun sözünü kəsdi:

- Telefonun məndədir, çıxanda verəcəm. Müşahidəni apar, bitəndə də yavaşca sürüş evinə.

Polis məntəqəni tərk edər-etməz bayaqkı qadınlar yenə qutuları bədənləri ilə hasara aldılar, seçicilər qatar-qatar gəlməyə, müşahidəçilər isə alverə qaldıqları yerdən davam etdilər. Fantomas qalib gəlmiş döyüşçü kimi kinayəli təbəssümlə Tağını süzdü, bu yekəxana gəncin tam zərərsizləşdirildiyinə əmin olduğu üçün arxasını etinasızlıqla ona çevirib qalstukunu düzəltdi və komissiya üzvlərinin əyləşdiyi masaya sarı getdi.

Özünü təklənmiş hiss edən gəlmə müşahidəçi ruhdan düşmüş, müşahidədən də vaz keçib yerində süst qalmışdı. Elə bu vaxt məntəqəyə eynəkli, qıvrımsaç bir gənc daxil oldu. Onu görən kimi, Fantomas yerindən dik atılıb o tərəfə yüyürdü. Oğlan müşahidəçi vəsiqəsini göstərib qutulara tərəf yeriyəndə bayaq Tağının cibinə nəşə atılması təklifini verən müəllim və Sadiq ona yetib qollarından tutdular və geriyə dartdılar.

Tağıya elə gəlmişdi ki, bu gənc Lənkərandandır, hətta bu məntəqədəkilərin də çox yaxşı tanıdığı biridir: o içəri girəndə az qala hamı bir-birinə dəymişdi. Bayaq Fantomasın üzünə qonmuş rahatlıqdan əsər-əlamət qalmamış, qutunun sıx əhatəyə almış qadınlar isə “döyüşə” hazır vəziyyətə gəlmişdilər.

Gənci güc-bəla ilə sakitləşdirib stula yenicə əyləşdirmişdilər ki, bu vaxt bir nəfər yan-yörəsinə baxa-baxa məntəqəyə daxil oldu. Bu adamın məntəqəyə ayaq basması ilə bayaqkı gəncin yerindən dik atılıb kamerasını işə salaraq ona tərəf şığıması bir oldu:

- Ay səni, qoca şarlatan! Qıldığın namazlar qənim olsun sənə, adam nə qədər üzsüz olarmış! Doymadın səs verməkdən? – deyə qışqıra-qışqıra kameranı ona tərəf tutdu və ora danışmağa başladı: – Əziz izləyicilər, mən hazırda 7 saylı məntəqədəyəm, – yenidən kobud və yöndəmsiz əli ilə üzünü kişiyə tutdu, – Hacı Rüstəm adlı bu şəxs isə bayaq 9 saylı və 10 saylı məntəqələrdə səs verib, indi də mən gördüyüm üçüncü məntəqədədir!

Sadiq həmin gəncin əlindəki kameranı alıb divara çırpdı, özünü isə yerə yıxıb kötəkləməyə başladı.

Tağı gördüklərindən dəhşətə gəlmişdi, reaksiya vermək, yerindən tərpənmək istəsə də, keyimiş vücudu sözünə baxmadı.

Kişi heç nə olmamış kimi, kabinəyə girib bir topa bülletenlə çıxdı, qadınların yaratdığı hasarı yarıb bülletenləri qutuya atdı və eyni qaydada, əyilə-əyilə, ürkək addımlarla məntəqəni tərk etdi.

Tağı bu şəxsin dünən onu mehriban qarşılayan, evinə qonaq edən, vaxtilə azadlıq hərəkatında olmuş həmin o adam olduğuna heç cür inanmaq istəmirdi. Hiss etdi ki, qulaqları cingildəyir, yanında yüksək səslə gülüşən müşahidəçilərin, seçicilərin və qutuları sıx hasar kimi dövrəyə almış qadınların bir-birinə qarışmış səsləri başını deşən küt uğultuya çevrilməyə başlayır.

Seçicilər gənci yerə yıxıb amansızcasına döyən Sadiqin yanından keçərək kabinəyə daxil olur, səslərini verib çıxırdılar. Gəncin burnunun qanı ağzından axan qara qana qarışmışdı. Sadiq bunu görüb onun yaxasını buraxdı və gənc tirtap yerə sərildi. Seçicilər yerə sərilmiş, qan içində olan adamı sezmirmiş kimi, onun üstündən növbə atlanırdılar. Həmin oğlan gecəyə kimi orada qalacaq, heç kim o tərəfə hərlənməyəcəkdi…

Tağının donuq baxışları növbə ilə səs verib məntəqədən çıxan adamları müşaiyət etməkdə ikən Fantamas məntəqəni daha yaxşı görsün deyə, yerdə hərəkətsiz vəziyyətdə uzanmış gəncin üstünə çıxmışdı. Bu sısqa vücudun burada olması daha onu narahat etmirdi.

Çöldə Tağının telefonu üzərində ciddi iş gedirdi. Polis telefonu ondan alanda cihaz açıq idi deyə, şifrə ilə əlləşmək kimi bir əziyyətə qatlaşmağa gərək yox idi.

Bir qədər sonra məntəqəyə qara paltolu, şərfi gözünə kimi çəkmiş adam daxil oldu. Tağı fikir versəydi, Fantomasın, Sadiqin ya da bir başqasının onu yoxlamadığına təəccüblənər, özünə yönəlik gizli baxışlarını görsəydi, yəqin canına vicvicə düşərdi.

Yad adam gəlib düz Tağının sol böyründə əyləşməzdən öncə ağbəniz müəllim qalxıb harasa yoxa çıxmışdı. Qarapaltolu şərfini açdı, bir ayağını o birinin üzərinə aşırıb, məntəqədə siqaret çəkməyin qadağan olunmasına baxmayaraq, qutudan birini çıxardı və yandırdı.

- Həə, belə-belə işlər! İnsanlar yaman həvəslidirlər. Torpaqlarımızı işğaldan azad edib alnımızdakı ləkəni təmizləyən liderə kim səs verməz!

Müşahidəçilərin oturduğu masa bir anın içində boşalmışdı, bayaq buranı qarğa bazarına döndərən müəllimlər sanki buxarlanmışdılar.

- Necə gedir? – Siqaretindən birini Tağıya uzadaraq soruşdu, imtina cavabı alınca onu qabına qoydu. – Sakit adama oxşayırsan. Hərçənd dedilər guya bayaq burda səs-küy salıbsanmış. Yəqin sən olmamısan, mənə yanlış informasiya veriblər. – Bu yerdə döşəmədə sərili qalmış hərəkətsiz bədənə baxıb sifətini turşutdu. Tağı yanındakının üzünə belə baxmırdı. Baxsaydı, gözlərinin birində bəbək olmadığını görüb ürkərdi.

Araya çökən sükut bir neçə dəqiqə davam etdi. Tağıya elə gəldi ki, məntəqə tamamilə boşalıb və təkcə ikisi qalıb.

- Bu insanları görürsən? Hamısı xirtdəyə qədər zibilin içindədir. Kimə inanasan axı? Həyat çox qəribədir, dünən sənə saflıqdan, haqdan, hüquqdan danışan mübariz adam bir də görürsən, elə oşibka[2] buraxır ki, matın-mutun quruyur. Hamısı ikiüzlüdür! Ona görə, gərək, sürüyə güclü nəzarət edəsən, yoxsa bir də ayılıb görərsən, daha gecdir, dövlət yıxılıb…

Tağı nəsə demək istədi, amma dili söz tutmadı. Elə bu sırada Məleykə məntəqəyə daxil olub komissiya üzvlərinin əyləşdiyi masaya yaxınlaşdı, bir neçə bülletenin olduğu bağlamanı yaxalığında gizlədib kabinəyə tərəf getdi, ora girməyi ilə çıxmağı bir oldu. Bunlar gözünün qabağında baş versə də, Tağı heç qımıldanmadı da. Məleykə də Tağını görmədi, işini görüb məntəqədən çıxdı.

---



[2] Xəta (rusca)

- Bilmirsən axı kimə güvənəsən, – qarapaltolu siqaretini sümürüb təəssüflənirmiş kimi, başını yellədi, – a kişi, adam sevdiklərinə bel bağlaya bilmir. Mən də gənc olmuşam, inanmışam, sevmişəm. Amma daha həyat həqiqətlərini dərk edə biləcək qədər təcrübə sahibiyəm. Bu həyatda mənə həmişə ilk zərbə sevdiklərimdən gəlib. Sevdiklərindən zərbə alan adam tanımadığı insanlara necə bel bağlasın?!

Tağının yumruğunun düyünləndiyini, alnındakı damarların şişib göyərməyə başladığını görəndə səsinə kədərli ton verdi:

- Baxırsan, cavan oğlandır, ağlı başında, savadlı, dünyagörüşlü, gəl ki, fədailik eşqinə düşüb həyatını məhv edir. Bu xalq həmişə özünə qurban axtarıb, versin qabağa və məhvini izləsin. Bunu dərk edən bu yoldan çəkinir, etməyən də şam kimi əriyib məhv olur. Özünə çoxlu düşmən, hər yerdə ögey rəftar, işsizlik və kimsəsizlikdən başqa qazandığı bir şey olmur. Heç yerdə də saya salıb adam yerinə qoymurlar. Bir də gözünü açıb görür ki, itirdiyi qədər itirib və ətrafında heç kim qalmayıb. – Ara verib sınayıcı nəzərlə Tağını süzdü; gəncin boşluğa zillənmiş donuq gözlərində bayaqkından fərqli olaraq qəzəb və nifrət işartıları sezsə də, sözünə davam etdi. – Kütlə qısqanc və vəfasızdır. Kiminsə daha yaxşı yaşamaq potensialı olub, həyatını kütlənin rifahı uğrunda qurban verməyə hazır  olduğunu görəndə onu daha da qızışdırır, tırkalayır, kritik məqamda da tək qoyur…

Tağı sanki daşa dönmüşdü. Yad adam daha bir siqaret götürüb yandırdı, sanki özü ilə danışırmış kimi, davam etdi:

- "Metamorfoza"nı oxumusan? Bax, eynən oradakı kimi, heç kimə lazım olmayan, hətta valideynləri üçün arzuolunmaz bir yükə çevrilmiş iyrənc bir varlıq! – Bu yerdə nəzərlərini boşluqdan çəkib yerdə hərəkətsiz uzanan gəncə çevirdi. – Əmin ol, belələrindən valideynləri də imtina edir!

Tağının iti hərəkətlə dönüb baxışlarını onun düz gözlərinə zilləməsi qarapaltolu üçün elə gözlənilməz oldu ki, damağındakı siqaret ağzından sürüşüb yerə düşdü. Sifəti qəzəbdən əyilmiş gəncin üzündəki ifadədən diksinmişdi. Bu cılız bədənli gənc birdən yerindən tapanca kimi atılıb kəlbətin kimi möhkəm barmaqları ilə onun xirtdəyindən yapışanda müvazinətini itirib kötük kimi yerə sərildi və döşəmədə dəhşətli boğuşma başladı. Fantomas və Sadiq özünü yetirincə üstünlük artıq qarapaltolun tərəfdə idi; o yumruğu ilə altındakı gəncin harasına gəldi döşəyirdi. Bir neçə nəfər birləşib Tağını döyə-döyə, sürüyə-sürüyə məntəqədən çıxardı…

***

Yarıqaranlıq məhkəmə zalında, gözlərinin altı gömgöy, qolları, boğazı və sifəti qançır olan gənc bir oğlandan, yanında yaşlı, saçı tökülmüş çəlimsiz vəkildən, qarapaltolu və bir də sir-sifətindən biganəlik yağan hakimdən başqa kimsə gözə dəymirdi. Dünənki davada tufli ilə qulaqlarına endirilən zərbələrin yaratdığı və beynini deşən cingilti səsləri Tağıya hakimin danışdıqlarını düz-əməlli eşitməyə imkan vermirdi. Başı möhkəm ağrıdığı üçün, əslində, zalda  deyilənlər onun üçün maraqlı da deyildi - o, bu dəqiqə canının hayında idi. Şüuru keyimişdi, amansızlıqla bədəninə endirilmiş zərbələrin yerinə elə bil köz basırdılar. Hakim dodaqlarını tərpətdikcə yanındakı vəkil də başı ilə deyilənləri təsdiqləyir, qarapaltolu isə gördüklərinə qımışmaqla reaksiya verirdi.

Bir neçə dəqiqə sonra iki cüssəli kişi Haqverdini zala gətirdilər. Tağıya elə gəldi ki, sol qolundakı oraq-çəkic döyməsi silinib yerinə svastika çəkilib. Tribunaya qalxıb əl-qol hərəkətləri ilə danışan Haqverdi tez-tez şəhadət barmağını ona və divardakı bayrağa tuşlayıb ağzı köpüklənə-köpüklənə az qala qışqırır, damarları şişmiş alnını qırışdırıb yumruğu ilə boşluğu hədələyirdi. Tağı uzun və bəlağətli nitqdən yalnız bunları eşidə bildi:

- Möhtərəm hakim, şahid kimi onu deyə bilərəm ki, bu gənc də dövlətə qarşı çıxan ünsürlərdən biridir… Qərb təşkilatlarından yüksək məbləğdə qrant alaraq… ölkəmizdə hakimiyyəti zorla devirmək üçün yaradılmış mütəşəkkil dəstənin üzvü kimi… xarici qüvvələrin daxildə çaxnaşma yaratmaq üçün… Bu və siyahısı əlinizdə olan daha bir neçə antimilli ünsür… qələbəmizə kölgə salmaq naminə öz şəxsiyyətlərini pula sataraq… suverenliyimizə təhdid olan qüvvələrin marioneti…

Nitqinə yekun vurduqdan sonra bayaqkı iki nəfər yenidən Haqverdinin qoluna girib zaldan çıxardı. Ağrıların şiddətindən yaranan hallüsinasiya idimi, yoxsa gerçəklik, Tağı bunu ayırd etməkdə çətinlik çəkdi: amma qəfildən hakimin gözlərindən qan gəldi və oturduğu kreslodan tirtap yerə sərilib canını tapşırdı. Onun ardınca yanındakı vəkil də sudurğa keçirib yerə sərildi. Zalın qapısından uzun saçlı, keçisaqqal oğlan içəri keçdi və balalaykanı götürüb ifa etməyə başladı. Ardınca seçkidən qabaqkı təlimə toplaşmış gənclər haradansa peyda oldular və zalda dövrə vurub rəqs etdilər. Dövrə getdikcə genişlənir, yeni-yeni adamlar ona qoşulurdu. Qarapaltolu gördüklərindən ağlını itirmişdi, əli ilə başına-gözünə çırpır, gizlənməyə yer axtarırdı. Amma gənclər ona fikir vermirdilər. Oğlan ifasını bitirən kimi mavi saçlı qız adamı valeh edən soprano səsi ilə solo ifaya başladı. Məhkəmə zalını ağzına qədər doldurmuş gənclər onu ayaqüstə alqışladılar. Məntəqədə döyülüb yerə sərilmiş oğlan da qapıdan içəri girdi və əylənən gənclərə qoşuldu. Tağı baş verənləri donuq baxışlarla izləyirdi.

Elə bu əsnada Məleykə haradansa peyda olub gəldi düz Tağının qarşısında durdu. Əlləri ilə üzünü tutub hönkür-hönkür ağlayan qadın ona təzyiq olduğunu, əlindən heç nə gəlmədiyini və etdiklərinə görə xəcalət çəkdiyini söyləyirdi.

Qarapaltolu içəridəki qələbəliyin yaratdığı fürsətdən istifadə edib aradan çıxmaq istəsə də, gənclərdən biri onun yolunu kəsdi. Onu bir anın içində üzük qaşı kimi mühasirəyə alan gənclər qəfildən yarasaya dönüb pəncərədən çıxan qarapaltolunun arxasınca fitləməyə, çırtıq çalmağa başladılar. Həmin gənclərin biri hər iki çiynində qutu ilə gəlib sevincək halda içindəki bülletenləri məhkəmə zalının döşəməsinə boşaltdı.

Döşəməyə toxunar-toxunmaz kağızlar göyərçinə çevrilib zalda pərvaz edəndə Tağının gözləri qaralmağa başladı; qulağındakı cingilti də tədricən zəifləyib sonra tamam kəsildi. O da ağ göyərçinə dönüb pəncərədən çölə uçdu və məhkəmə binasının damına qondu.

Gün batmaqda, göy qübbəsi isə tədricən tündləşən mavi-çəhrayı buludlarla çevrələnməkdə idi. Ağ göyərçin az sonra arasında süzüb ənginliyə qovuşacağı buludlara, bəlkə də, son dəfə aşağıdan baxdı və qanadlarını açıb göyə tutdu. Sanki bu metamorfoza üçün Tanrıya minnətdarlıq edirdi.

Bir neçə dəqiqə sonra isə buludlara tərəf yüksəlməkdə idi. Yüksəldikcə yüksəlir və əbədi müdrikliyin bir zərrəsinə çevrilirdi…

Üçüncü hissə

## HALQA

*Yenə kitabları, türküləri, bayraqlarıyla gəldilər,*
*Dalğa-dalğa aydınlıq oldular,*
*Qaçdılar qaranlığın üstünə.*
*Meydanları zəbt etdilər yenə.*

Gözünü açanda üfüq yavaş-yavaş qızarırdı. Ayağa qalxmağa ərindi, gözlərini mavi ənginliyə dikib şehli otların üstündə xeyli uzanılı qaldı. Sonra dikəlib oturdu, gözünü ovxaladı. Başı möhkəm ağrıdığı üçün boynunu çətinliklə tərpətsə də, o üz-bu üzə çevrilib ətrafına boylandı. Yaxınlıqdakı dağın ətəyində, uzaqdan çox səliqəli görünən sıx evlərdən ibarət şəhərcik və onu dövrəyə almış, ucu-bucağı görünməyən meşə, yaxınlıqdakı çəmənlikdə otlayan qoyunlar və onları müşahidə edən yeniyetmədən başqa nəsə çəkmədi diqqətini. Başının ağrısı şiddətlənirdi, dayana bilməyib yenidən otluğa uzanmağı ilə yuxuya getdi.

İkinci dəfə ayılanda başının üstündə bayaqkı balaca çobanı görüb diksindi. Çoban da yüngülcə səksənib geri çəkildi. Bir neçə saniyə baxışdıqdan sonra hövlnak ayağa qalxdı, uzandığı yerə əyilib əli ilə yoxladı. Bel çantasını və tüfəngini çiyninə vurub üzünü çobana çevirdi. Onunla rastlaşdıqdan bu yana keçən üç dəqiqədə ilk dəfə qarşısındakı adamı başdan-ayağa süzdü. Boynuna keçirilmiş bürünc halqa bayaq da diqqətini çəkmişdi, amma indi onun üzərində hərflər və deşikləri gözü tutdu. Birləşdirib oxumaq istəsə də, alınmadı, oğlanın da sual dolu baxışlarının onun boğazına dikildiyini görüb biixtiyar əlini ora apardı. Əlinə heç nə dəymədikdə, düşünmədən ağlına gələn ilk sualı verdi:

- Qağa, mən, deyəsən, yolumu azmışam. Bura haradır?

- Tərazən şəhəri, – sanki bu sualı gözləyən çobandan cavab dərhal gəldi.

- Nə?

- Tərazən, – çoban gülümsəyərək təkrarladı.

- Ən yaxın şəhər hansıdır?

- Ən yaxındakı, dağın o başında yerləşən Nalay şəhəridir. Yaxınlığında Tənayəx və Tərfin adlı iki balaca şəhər də var. Bir saatlıq məsafədə də paytaxtdır, – çoban sözünü bitirib yenə gülümsədi.

"Bura necə düşmüşəm mən? Maşın hanı? Uşaqlar haradadırlar?…Yəqin onlar da hardasa yaxın yerdə olarlar. Yığım gərək."

Yad adam əlini cibinə atıb telefonunu çıxardı. Qaşlarını düyünləyib telefonu gah sağ, gah sol tərəfə çevirdi, bir neçə addım gedib göyə tutdu, yenə bir neçə addım irəliləyib eyni hərəkəti təkrarladı. Çoban yad adamın qəribə davranışlarını küt maraqla izləyirdi.

- Burada set tutmur?

Çoban sual dolu nəzərlərini telefondan çəkib yad adamın gözlərinə dikdi:

- Set nədir ki?

- Set də. Şəbəkə, internet. Necə izah eləyim? Əlaqə saxlamaq üçün. Məndə nəsə tutmadı burada…

- Bir dəqiqə, başa düşmədim, nə gərək var ki buna?

Yad adam duruxdu. Gözlərini qıyıb çobanı yenidən süzürmüş kimi soruşdu:

- Sənin telefonun var?

- Var, – çoban gülümsündü.

- Onunla nə edirsən?

- Budilnik qururam ki, tezdən durum, hər gün qoyunların sayını yazıram, dükanda olanda haqq-hesab işi aparıram, şəkillər çəkirəm, burada boş-bikar olanda da oyun oynayıram, – çoban cibindən telefonunu çıxarıb göstərdi və yenidən cibinə qoydu.

- İnternetə girmirsən bəs? Zəng edib əlaqə saxlamırsan?

- Burada internet yoxdur ki. Zəngə də nə ehtiyac? Hamı şəhərdədir, təcili nəsə lazım olsa, məktuba yazıb Ceklə yollayacam da, – mehriban baxışları ilə yaxınlıqdakı iri, sarı köpəyi göstərdi.

- İnternet təkcə burada yoxdur, ya şəhərdə də?

- Şəhərdə də. Deyilənə görə, bir neçə il əvvəl olub. Amma sonradan necəsə yoxa çıxıb, - çoban bunu deyib əlini boğazındakı halqaya apardı.

Həmsöhbətinin ciddi səhvə yol verdiyini duyduğundan utanıb duruxduğunu yad adam da hiss etdi.

- Buralarda ortayaşlı, biri uzunboy, digəri nisbətən gödək iki adam görməyibsən?

- Yox, görməmişəm. Mən səhər gələndə təkcə siz idiniz.

- Aydındır… O yol şəhərə aparır?

- Hə, amma komendant saatıdır indilərdə və, – çoban nəsə demək istədi, amma dayandı və sifəti pörtmüş kimi oldu.

- Və nə?

- Heç nə, deyəcəkdim polislər küçələrdə gəzişirlər, ehtiyatlı olun.

- Əşi, mənə lazımdır qarşıma biri çıxsın, polis olsa, daha yaxşı, bəlkə bir köməyi dəydi… Yaxşı, çox sağ ol. Yorulmayasan, – çobanın bayaq nəyi qəsd etdiyini soruşmaq istədisə də, bu fikirdən daşındı və ondan uzaqlaşıb şəhərə doğru istiqamət aldı.

Belə ucqar yerlərdə insanların internet və hətta müasir texnologiyalardan da uzaq düşdüyünü bilirdi. Amma onun fikrini məşğul edən şeylər başqa idi. Bayaq çobanın çəkdiyi adları ömründə birinci dəfədir eşidirdi. Bura hara idi? Hara düşmüşdü? Axı çoban onunla eyni dildə danışırdı. Bəlkə ucqar dağ kəndləridir? Yox, o paytaxtdan da bəhs etdi… Nə qədər çalışsa da, paytaxtdan bir saatlıq məsafədə belə yer olduğunu heç cür xatırlaya bilmədi. Onu ən çox narahat edən məsələ isə dostlarının harada olması idi. Bəlkə, şəhərdədirlər? Ola bilər, hər halda ən yaxın yaşayış məskəni bura idi. Gedib dərdini polisə danışar, dostlarını da tapıb qayıdarlar… Bu düşüncələrlə bir də gördü, artıq şəhərdədir.

Küçələrdə heç kim gözünə dəymirdi. Sanki bütün şəhər tərk edilmişdi. Amma bu tənhalıqda da ona qəribə görünən şeylər vardı. Bir anlıq ona elə gəldi ki, gözəgörünməz əl onun gəlişindən bir neçə dəqiqə əvvəl bütün əhalini girov götürüb. Hətta bəzi mağazaların, kafelərin qapıları belə açıq idi.

Bir neçə döngə keçmişdi ki, divardakı oyuqdan gələn kişi səsinə diksinib çevrildi:

- Ey, nə gəzirsən?

Yad adam sualı anlamayıb gözünü döydü.

- Bilmirsən, bu vaxt şəhərə çıxmaq olmaz?!

- Mən… yox… açığı, mən… mən azmışam. Buralı deyiləm.

- O saat bəlli oldu! Tez gir içəri, görüblərsə, işin bitib. Gir, tez! – Səs oyuqdan gəlsə də, sahibi gözə dəymirdi.

Yad qapını tapıb özünü içəri saldı.

Burada onu gülünc görkəmli, arıq, ortayaşlı, saçı tökülmüş ev sahibi qarşıladı. Balaca, monoton və rütubətli otaqda elə də çox şey yox idi. Yalnız stolun üstündəki akvarium diqqətini çəkdi. Ev sahibi yad adamın duruxduğunu görüb əyləşməyə dəvət etdi və qazın üstündəki qəhvədanı götürüb həm ona, həm də özünə çay süzdü. Onun da boğazında çobandakı kimi halqa vardı, amma gümüşü idi.

- Komendant saatı elan olunandan sonra hamı işini yarımçıq buraxıb evinə gedir, ondan sonra da şəhərə çıxmaq qəti qadağan olunur. Allahından səni görüb eləməyiblər, inşallah kameralara da düşməzsən. Tutub-eləsələr, deyərsən buralı deyiləm, azmışam, buraxarlar… De görüm, kimsən, haradansan? Necə gəlmisən buralara?

Çiynindəki tüfəngi divara söykəyən yad adam:

- Qardaş, mən heç bilmirəm ey, bura haradır. Bakıdanam, iki gün əvvəl dostlarla Qazaxa istirahətə gəlmişdik, dünən qərarlaşdıq ki, ova da çıxaq. Axşamüstü düşdük dumana, tərslikdən maşın da xarab oldu. Nə qədər etdik, işə düşmədi, dedik, gecəni yataq, bir həll yolu düşünərik səhər. Necə möhkəm yuxulamışamsa, bir də oyanıb özümü bu dağın ətəyindəki otluqda uzanmış gördüm. Uşaqlar da, maşın da yox idi. Qalmışam belə, bilmirəm hara gedim. Bəlkə sən kömək edəsən?

Ev sahibi üzünü qaşıya-qaşıya:

- Bakı haradır, Qazax haradır, ay qardaş? Bura Tərazən şəhəridir. Dağın o başında da paytaxtdır…

- Paytaxt haradır ki? – Yad adam ev sahibinin sözünü kəsdi.

Duruxan ev sahibi əlini boğazındakı halqaya aparıb ayağa qalxdı, şkafın gözündən dəsmal çıxardı, suyu açıb bir az altında saxladı və azca sıxıb halqanın üstünə sərdi. Ev sahibinin bundan xeyli rahatlaşdığını hiss etdi.

- Paytaxt Milsətdir, yanaşı yerləşən üç şəhərdən ən böyüyü. Əcnəgşi ilə Qiyzətdən sonra gəlir, dağdan təxminən otuz kilometrlik məsafədədir. Bizə oralara getməyə icazə yoxdur. Deyəcəm, gülmə, amma heç mən də ömrüm boyu getməmişəm ora. Gedirik e getməyinə, o da ki, yalnız bizdən kimsə onların, – şəhadət barmağı ilə yuxarını göstərdi, - müəyyən etdiyi qırmızı xətləri aşanda ora getmək fürsəti qazanır. Amma ki qayıtmır, – gülümsəyib başını buladı.

- Niyə boynundakı halqanı yaş əsgi ilə örtdün? – Yad adam marağını heç cür boğa bilmədi.

- Bu, deyəsən, təkcə mənim ağlıma gəlib, – ev sahibi qımışaraq əli ilə yaş əsgini bərkidib sözünə davam etdi: - Bunu on səkkiz yaşımız tamam olanda taxırlar boğazımıza. Əsas işi bizi təbəqələrə görə fərqləndirməkdir, çünki cəmiyyətdə tutduğumuz yeri bu müəyyən edir. Həm də bununla hər yerdə etdiyimiz davranışlara, dediyimiz sözlərə nəzarət edirlər, olduğumuz təbəqəyə görə də materialı dəyişir. Keçən il öyrəndim ki, halqanın əsas canı onun üstündəki balaca deşiklərdir. Onu tıxayanda yuxarıların gözləri bağlanır, – ev sahibi əlini-əlinə vurub güldü, – bir dostum vardı, o öyrətmişdi mənə. Müxalif idi yaman, bizə hər dəfə gələndə halqanın üstündəki deşiklərə saqqız yapışdırıb başlayırdı hökumətə döşəməyə. Hər dəfə deyirdi ki, gizli təşkilat quracaq, özü kimi düşünənləri ətrafında cəmləyəcək. Deyəsən, hardasa danışanda saqqız yapışdırmağı unudubmuş, ya da agentlər mərkəzə xəbər çatdırdığı üçün, necəsə axırda bunu tutdular və apardılar paytaxta. Bir neçə aydır, ondan xəbər yoxdur. Heç maraqlanmağa cəsarət edən də. Elə bil belə biri heç mövcud olmayıb… Ehtiyatlı olasan gərək, amma…, – kişinin rəngi ağardı, ayağa durub bir neçə addım geri çəkildi.

Baxışlarından yad adam dəhşətə gəlib ixtiyarsız qalxdı.

- Mən də, deyəsən, çox böyük səhv etdim…

Ev sahibinin pıçıltı ilə dediyi sözləri yad da eşitdi. Kişi bir dəqiqə içində elə dəyişmişdi ki, sanki bayaqkı adam deyildi. Qəfildən ağlamağa başlayıb yerə diz çökdü:

- Qardaş, qurban olaram, keç günahımdan. Mən hökumətə sadiq adamam, heç bir şəkildə ona qarşı çıxanlara haqq qazandırmaram. Kasıb adamam, bağışla səhvimi, qurban sənə… Azarını alım, keç, bir səhvdir elədim…

Heç nə anlamayan yad adam nə deyəcəyini bilmədi. Ev sahibinin davranışı onu əməllicə çaşdırmışdı, nəzərləri heyrət içində ona zillənmişdi.

- Qələt eləmişəm, pox yemişəm! Vallah, bir də eləmərəm. Axırıncı dəfə olsun, and olsun bir də…

- Ay qardaş, nə olub, nəyi eləməzsən, nə and-aman edirsən?

Kişi sınayıcı nəzərlərlə yad adamın gözlərinin içinə baxdı. Gözünün yaşı da qurudu, bir neçə saniyə beləcə dayanıb axır ki, sükutu pozdu:

- Qardaş… Sən… Sən dəqiq buralı deyilsən?

- Hə, bu da pasportum, buyur, – yad adam cibindən pasportunu çıxarıb ev sahibinə uzatdı.

Ev sahibi əli əsə-əsə ona uzanmış kağızı aldı, o tərəf-bu tərəfə çevirib bir xeyli baxdı və geri qaytardı. Yenidən stula əyləşib dərindən ah çəkdi, əli ilə əsgini yoxlayıb möhkəm durduğundan əmin olduqdan sonra sözə başladı:

- Üzrlü say, qardaş, heç kimə güvən yoxdur indi. Bu yaşıma kimi o qədər xəyanət görmüşəm ki… Dost dostu, qardaş qardaşı, oğul atasını ələ verir, güvən, etibar, inam deyə bir şey qalmayıb. Bu da mənə dərs olsun. Gördüm, komendant saatında küçədə gəzirsən, özün də yadelli, yazığım gəldi. Amma əvvəlcədən sənin qəsdən mənim evimin qabağından keçməyin ehtimalını düşünməli idim. Sözüm sənə deyil ha, incimə məndən, istənilən halda ehtiyatı əldən buraxmayasan gərək…

- Başa düşürəm səni, bizdə də oxşar vəziyyətdir. Narahat olma, məndən sənə ziyan gəlməz, – yad adam ev sahibinin əndişəsini azaltmaq, şübhələrini dağıtmaq üçün sakitləşdirici tonla davam etdi, - biz də öz ölkəmizdə azad deyilik. Fərqli fikrə dözüm yox, azad fikirli nə qədər insan həbsdədir. Etirazlar susdurulub, danışanların sayı azaldıqca quruluş daha da möhkəmlənir. İnsanlar da ona görə ruhdan düşüb. Həm də, arxasınca gedəcəkləri lider də yoxdur… Başa düşürəm səni, mənə də güvənə bilərsən, narahat olmağına əsas yoxdur. Mənim sadəcə buradan çıxmağa yardıma ehtiyacım var.

Ev sahibi bayaqkına baxanda xeyli xətircəm görünürdü. Cibindən çıxardığı dəsmalla alnının tərini silib niyəsə divarın içində oyulmuş sobaya baxdı və səsini qısdı:

- Bizdə hamı bir qarın çörəyə möhtac buraxılıb, çoxluq bunun uğrunda bütün dəyərlərinə təpik atmağa hazırdır. İndi danışdıqlarımıza və davranışımıza nəzarət edirlər, deyilənə görə, – səsini bir az da qısıb az qala pıçıltı ilə, – paytaxtda düşüncələrə də nəzarət etmək üçün yeni metod üzərində işləyirlər. Ondan sonra bütün varlığımız nəzarətə alınacaq, insanlar düşünməyə də qorxacaqlar. Hətta rahatlığı naminə düşünməyi buraxacaqlar belə. Çox düşünənin başı ağrıyır bu məmləkətdə, – mənalı-mənalı gülümsəyib göz vurdu.

- Çoban dedi, şəhərdə internet yoxdur. Bəs necə xəbər tutursunuz gündəmdən? Televizor da yoxdur? Heç olmasa, qəzet zad buraxılır?

- Bizdə təxminən on il qabaq internet də vardı. Sonradan gedişata nəzarət edə bilmədilər, insanlar saxta profillərlə də olsa, öz fikirlərini yazırdılar. Başqalarının onları oxuması, yatmışların oyanması yuxarılara sərf etmirdi. Müharibə dövründə yalan xəbərlərin yayılması bəhanəsi ilə bütün ölkədə internetə çıxışı məhdudlaşdırdılar. Ağızlarında şirə qaldı, müharibə bitən kimi, paytaxtdan başqa bütün şəhərlərdə internetə çıxış qapandı. Televizorda da axşama kimi şou, əyləncə, yemək verilişləri verirlər, xəbərlər ancaq dövlət kanalında yayımlanır, o da gündə bir buraxılış gedir, hesabatlar və statistikalar barədə, axşama kimi də onun təkrarını verirlər. Qəzetlə oxuyuruq gündəmi, paytaxtdan gəlir hər gün, budur ey, – stolun üstündəki qəzeti yad adama tərəf uzatdı.

Qəzetin ilk səhifələri başının ortası tökülmüş, üzündən zəhrimar yağan adamın müxtəlif tədbir və görüşlərdən çəkilmiş şəkilləri ilə dolu idi. Yad adam qəzeti çevirib adına baxdı, "Xalq qəzeti" sözünü görüb istehza ilə gülümsədi.

- Bizdə xalq odur, gördüyün bu boynuna halqa taxılmış qara camaat isə sürüdür.

- Bəs bu qədər şeyi bilib niyə səsini çıxarmırsan? Bayaq deyirdin, hökumətə sadiqsən, indi də bütün bunları danışıb gileylənirsən, – yad adam sınayıcı, bir az da məzəmmətedici nəzərlə ev sahibini süzdü. Ev sahibi bir az pərt olub yenə az qala pıçıltı ilə davam etdi:

- Bunları az-çox düşünmə qabiliyyəti olan hamı bilir. Amma heç kim canından bezməyib. Can şirin şeydir, təhlükəyə düşəndə heç zad gözə görünmür. Həm də ki, az görməmişik həqiqəti deyib yoxa çıxan adamları. Nəyi dəyişə bildilər? Heç nəyi! Qarşılığında isə unuduldular, yaxınları belə adlarını çəkməyə qorxurlar… Nəysə, çayını iç, get uzan, səhər çıxarıq. – Ev sahibi söhbəti dəyişib ayağa durdu. – Məsləhət görmürəm, polis şöbəsinə yaxınlaşmağı. Dostların onların əlinə keçibsə, işləri yaxşı deyil. Səni də görsələr, aparacaqlar sorğu-suala. Bəlkə, iş sərhədi qanunsuz keçməyə, hətta casusluğa qədər getdi. Bir-iki il qabaq belə biri olmuşdu, casusluq ittihamı ilə ömürlük verdilər. Yola salaram Nalay şəhərinə, onun yaxınlığındakı Tənayəx şəhərində bir dostum var, tapşıraram, sənə kömək edər, qayıdarsan ölkənə. Mənə görə nə qulluğun olsa, qonşu otaqdayam. Qapını da döysələr, açma. Çalış yatasan.

Ev sahibi bunu deyib hələ axşamüstü olmasına baxmayaraq işıqları söndürdü və qonşu otağa yollandı. Yad adam yatmağa çalışdısa da, yata bilmədi, bir xeyli gözünü tavana dikib durdu.

“Görəsən, məni ələ verməz ki? Mərd və sadəlövh adama oxşayır, amma yaman qorxaqdır. Məni axtarsalar, canının qorxusundan təhvil verməsə, yaxşıdır.”

Səhər tezdən qapı döyüləndə yerindən dik atılıb o biri otağa qaçdı, tez ev sahibini oyadıb qapının döyüldüyünü xəbər verdi. Ev sahibi tənbəl-tənbəl mızıldanıb saata baxdı, "get gözlükdən bax gör, kimsə yoxdursa, deməli, poçtalyondur, qəzet qoyub gedib" deyib yenidən üzünü divara çevirdi. Yad adam ehtiyatla qapıya yaxınlaşdı, başını gözlüyə dirəyib baxdı, kimsəni görməyib xeyli rahatlaşdı.

Ev sahibi oyanandan sonra qəzeti də qapının ağzından götürüb tez-tələsik oxudu, əlində qəzet qonşu otağa gedib beş dəqiqə sonra qayıtdı və onu etinasızlıqla stola fırladıb anlaşılmaz dildə mahnı oxuya-oxuya səhər yeməyi hazırlamağa başladı. Yad adam darıxırdı, yeməyi yeyib çıxmaq barədə düşünürdü. Saata baxdı – səkkizə on dəqiqə işləyirdi. Bikarçılıqdan qəzeti əlinə alıb səhifələdi, zəhmli adamın az qala hər yerdə müxtəlif tədbirlərdən şəkillərini və sitatlarını görəndə ürəyi sıxıldı. Qəzetə iyrənc böcəyə baxırmış kimi sifətini turşudub yenicə stola qoymuşdu ki, nə fikirləşdisə, onu yenidən əlinə aldı. Bayaq baxanda bir şey ona qeyri-adi görünsə də, ötüb keçmişdi. Qəzeti tez səhifələyib həmin yeri tapdı və dəhşətdən az qala sifəti əyildi: üçüncü səhifədə iki cüssəli zabitin qoluna girdiyi, başına qara torba keçirilmiş bir nəfərin şəkli üzərinə böyük qırmızı hərflərlə "Ölkəmizdə təxribat yaratmağa çalışan casus elə sərhəddəcə tutularaq həbs edildi!" başlığı yazılmışdı. Xəbər qısa idi, detallar açıqlanmırdı:

"Dünən səhər saatlarında sərhəd gömrük xidməti nəzarətçiləri bir nəfər naməlum şəxsi tutaraq təhlükəsizlik xidmətinə təhvil vermişdir. Dövlət Təhlükəsizlik Xidmətinin mətbuat xidmətindən bildirilib ki, həmin şəxs casusluq fəaliyyətində şübhəli bilinir. Hazırda kompleks istintaq-əməliyyat və beynəlxalq hüquqi prosedur tədbirləri həyata keçirilir."

Bu çox güman, onun dostlarından biri idi, amma onu ən çox sarsıdan dostunun həbsi deyildi. Aşağıda onun otluqda uzanmış şəkli ilə birgə daha bir xəbər yer almışdı:

“Şəkildəki şəxs axtarılır! Ehtimal edilir ki, bu naməlum şəxs də yuxarıda bəhs edilən şəxslə birlikdə sərhədi keçmişdir. Axtarış tədbirləri davam edir, vətəndaşlardan isə xahiş olunur ki, bu şəxsi gördükdə bizə məlumat versinlər.”

Əlləri əsə-əsə qəzeti yerinə qoydu. Hiss etdi ki, təkcə əlləri deyil, dizləri də onlara qoşulub. Az öncə oxuduğu xəbərdən sonra sanki qanı donmuşdu, beyni ancaq qaçmaq barədə düşünürdü. Hara qaçacaqdı? Bütün şəhərdə onu axtarırdılar… Bir dəqiqə, axı ev sahibi ona söz verib, dünən demişdi ki, qonşu şəhərə yola salacaq. Bunu düşünərək dodağının altında mahnı zümzümə edə-edə salat doğrayan ev sahibinə tərəf baxdı. Bir qədər rahatlaşmışdı ki, qəfil ağlına gələn fikirdən bədəninə üşütmə düşdü: ev sahibi qəzeti oxumuşdu, artıq yerini bilirdilər…

Yad adamın rənginin qaçdığı qıraqdan hiss olunsa da, ev sahibi sanki heç nə olmamış kimi, yeməyi süfrəyə qoyub masa arxasına keçdi. Yad bilmirdi nə etsin, içi içini yeyirdi. Cəlladı qarşısında oturmuşdu və ən dəhşətlisi də, heç nədən xəbəri yoxmuş kimi davranırdı. Kaş ki, ayağa qalxıb üstünə cumsaydı, əllərini-qollarını bağlayıb gözünün qabağında polisə xəbər etsəydi. Qeyri-müəyyənlik içini yeyirdi. Bəlkə, heç ev sahibi xəbəri oxumamışdı? Ola bilməzdimi, nəzərindən qaçmış olsun, fikir verməsin? Ya da oxusun, amma insani duyğuları ağır bassın? Yox, bu mümkün deyil, bu halda onu mütləq xəbərdar edərdi… Ev sahibinin susqunluğu ona daha çox əzab verirdi. Bilmirdi, bu dəqiqə tək istədiyi şey polislərin tez gəlməsi və bu hengamənin sona çatması idi.

Yemək yeyə-yeyə kəlmə belə kəsmədilər. Dəqiqələr ötdükcə yad bayaqkı şübhəsinin gerçək olduğuna daha çox əmin olurdu. Hər an qapının döyüləcəyini, polislərin içəri doluşub onun qolunu buraraq maşına mindirəcəyini və bölməyə aparacağını gözləyirdi. Tez-tez narahatlıqla pəncərəyə sarı boylanan yadın təşvişini ev sahibi də duymuşdu. Ev sahibinin sakit davranışındakı qeyri-təbiilik onu az qala dəli edəcəkdi. Bir anlıq istədi dursun ayağa, ev sahibinin də üzünə tüpürüb getsin özü təslim olsun, amma tez də bu düşüncəni özündən uzaqlaşdırdı. Bir tərəfdən ürəyində onu asıb-kəssə də, digər tərəfdən yazığı gəlir, halına acıyırdı. Bu adamın başqa yolu yox idi: o, çuğulluq etməsə, onlar tapsaydılar, başı ağrıyacaqdı.

Axır ki, özünü sakitləşdirdi və sükutu pozmaq qərarına gəldi, sifətinə saxta maraq verdi:

- Qardaş, dostuna xəbər vermisən? Haçan çıxırıq?

Ev sahibi udqunub boğazını arıtdı, vaxt udmaq üçün salfetka ilə ağzını silib cavab verdi:

- Hə, bayaq danışdım. Dedi siz əziyyət çəkməyin, mən özüm gəlib götürərəm dostumuzu.

"Ay oğraş, denən də, polisə çuğullamışam səni, bir azdan gəlib paketləyəcəklər!"

Yad özünü gülümsəməyə məcbur edib başını minnətdarlıqla yellədi və ixtiyarsız pəncərəyə boylandı.

- Lap yaxşı, qardaş. Çox sağ ol qonaqpərvərliyin üçün. Nə qədər təşəkkür etsəm, azdır. Allah əvəzini versin!

Ev sahibi dodağının altında təşəkkür edib baxışlarını yayındırdı. Bir neçə dəqiqə keçdikdən sonra yad qolundakı saata baxıb yenə narahatlıqla pəncərəyə boylandı. Pəncərə alçaqda idi, küçədən keçən maşınlar və adamlar açıq-aydın görünürdü. Fikirli-fikirli baxarkən dodaqları arasından çıxan sualın heç özü də fərqinə varmadı:

- Nə vaxt gəlib çıxacaqlar, görəsən?

Səhv buraxdığını hiss etsə də, əvvəl üzünü çevirmədi. Buraxdığı səhvdən özü də həzz aldı, utandığından qovrulan ev sahibinin daxilində özü ilə apardığı əlbəyaxa mübarizənin səslərini qulağı ilə eşidirmiş kimi oldu. Bir xeyli belə dayandı, ta ki arxada açılan şkafın taqqıltısını və suyun şırıltısını eşidənə kimi. Ev sahibi əsgini sıxıb halqanın üstünə qoydu və dizini yerə atıb ağlamağa başladı.

- Bağışlama məni, mən bağışlanası adam deyiləm. Soxsunlar mənim kimi peysərin boyunu yerə… Allah öldürsün məni, belə şərəfsiz məxluq ölsə, yaxşıdır!

Bayaq nifrətdən boğub öldürmək istədiyi iyrənc məxluq indi onun gözündə məzlum, müdafiəsiz həşərata dönmüşdü. Ev sahibinə əsəbi olsa da, hönkürtüsü ürəyini sızlatdı, bir xeyli tərəddüddən sonra qalxdı, yaxınlaşıb əlini çiyninə qoydu:

- Başa düşürəm səni, amma kaş ki, deyərdin, özüm gedib təslim olaydım… Daha keçib, dur ayağa, yekə kişisən. Canın sağ olsun, edəcək bir şey yoxdur.

Otaqdakı sükutu saatın aramlı tıqqıltısı və getdikcə zəifləyən hıçqırıq səsləri pozurdu. Bir neçə dəqiqə sonra nə edəcəyini dəqiq bilən adamlar kimi ayağa qalxdı, xalçanı qaldırıb altındakı balaca kvadrat qapının üstünü silə-silə:

- Yox, qurban sənə, mən özümü bağışlaya bilməyəcəm. Gizlənərsən padvalda, deyəcəm qaçdı, tuta bilmədim… – Halqanın üstündəki əsgi yavaşca sürüşüb düşsə də, həmin an heç biri bunun fərqinə varmadı, – Allah yıxsın bu hökumətin evini! And olsun bezdiriblər milləti… Sənə qarşı səhv elədim, mən ölüm, boyun qaçırma, gir bura, deyərəm qaçdı… Əlim qırılaydı o şərəfsizlərə xəbər verəndə, qırılaydı əlim. Tez gir, gələcəklər indi…

Ev sahibinin sifətinə qəfil çökmüş ifadədən yad da qorxdu:

- Vay, dədə!…

Hər ikisinin baxışları eyni anda bir nöqtəyə zilləndi – əsgi yerdə idi… Bəli, burada yanlışlıq yox idi, həmin əsgi idi, bayaq ev sahibinin isladıb halqanın üstünə sərdiyi əsgi. Yad, birinci, halqanın üstünə baxdı. Orada əsgini görmədikdə isə canından gizilti keçdi. Nəzərlərini halqadan çəkib kişiyə baxanda içini çəkdi, – kişi on saniyə içində on il qocalmışdı, - gözünü yerdəki əsgiyə dikib sanki ayaq üstə qurumuşdu. Sükut ya bir neçə saniyə, ya da bir xeyli davam etdi, həmin an zaman hər ikisi üçün önəmini itirmişdi. Hətta yad adama elə gəldi ki, saatın əqrəbləri də dayanıb, daha tıqqıldamır. Nəhayət bu amansız, öldürücü sükutu qapını təpiklə qırıb içəri girən maskalılar pozdu…

Həmin axşam bir neçə dəqiqə fasilə ilə Tənayəx və Əcnəgşi şəhərinə iki qara maşın daxil oldu. Nə vaxtsa Tənayəx şəhərinin sakinlərindən kimsə şəhərə qara maşın girdiyini görəndə zarafatla “Halqa yenə baş qoparacaq” demişdi və bu deyim tez bir zamanda bütün şəhərə yayılaraq məsələ çevrilmişdi. Bu gün də, görünür, halqa kiminsə başını aparacaqdı…

***

Başına torba keçirildiyi üçün hara aparıldığını görmədi. Yol gedərkən belə yanındakılar və sürücü kəlmə belə kəsməmişdi. Təkcə maşın mühərrikinin səsi gəlirdi, hətta bir ara düşündü ki, maşın özbaşına irəliləyir. Bəlkə də, içəri girən maskalıların onun qolunu burub başına torba keçirərək zorla maşına mindirdiyini unutsaydı, buna inanardı da.

Maşın dayandı. Yanındakı iki nəfər qoluna girib maşından düşürtdülər və harasa doğru addımlamağa başladılar. Təxminən on metr irəliləmişdi, ona elə gəldi ki, hava bir az isindi; az sonra arxasınca dəmir qapının şaqqıltı ilə örtüldüyünü eşidəndə qapalı məkanda salındığına əmin oldu. Yanındakılardan biri başındakı torbanı çıxardıqda əvvəl gözü qamaşdı, amma tez də buna öyrəşdi və ürkək baxışlarla ətrafına baxdı – irəlilədikləri dəhlizin ucu-bucağı görünmürdü, özü də zəif işıqlandırılmışdı. Qəribə idi ki, dəhliz boyu, bəlkə də, yüzlərlə qapı olsa da, cəmi bir nəzarətçi gözə dəyirdi, o da təxminən otuz metr aralıda oturduğu stuldaca mürgüləyirdi.

Onu kameraya salıb qapını bağladılar. Uzaqlaşdıqca zəifləyən addım səsləri təxminən iki dəqiqə sonra tamam kəsildi və otağa qulaqbatırıcı sükut çökdü. Kamera qaranlıq idi, yalnız qürubdan sonrakı mavi-çəhrayı səmadan süzülən işıq nəfəslikdən içəri düşürdü. Beton döşəmənin üstündə dizlərini qucaqlayıb oturdu və gözləməyə başladı. Onu nə gözlədiyi barədə heç bir təsəvvürü olmasa da, haradan qaynaqlandığını bilmədiyi əcaib bir qorxu vardı içində. Qeyri-müəyyənlik bəzən zamanı bəlli olan ölümdən də qorxulu ola bilir… Görəsən, dostları hardadırlar? Biri dəqiq tutulub, bəs digəri? Üçünün də bu dəhlizdəki ayrı-ayrı kameralarda saxlanıldığını düşünəndə bədənindən gizilti keçdi. Bir az sorğu-sual edib buraxacaqları fikri ilə özünü sakitləşdirməyə çalışırdı ki, bir-iki metrlikdən gələn öskürək səsinə diksindi.

- Qorxma, qadası, – qaranlıqdan qalın kişi səsi gəldi.

İçəridə tək olmadığına çox sevinsə də, söhbət etməyə ehtiyat edirdi. Düşündü ki, yaxşısı budur sakit dursun, onsuz bu xarabaya düşəndən normal adamla rastlaşmamışdı.

- Sən də halqanın poxuna düşmüsən? – Naməlum adam gülə-gülə soruşdu.

- Yox, mən buralı deyiləm. Dostlarla ova çıxmışdıq, axşam maşın xarab oldu, dedik səhər açılsın, bir əncam çəkərik. Səhvən sərhədi keçmişikmiş, onlar da necəsə yoxa çıxıblar gecə ilə. Biri yerindəcə tutulub, məni də bu gün tutub gətirdilər bura. Görək başımıza nə gəlir.

Naməlum adam gülə-gülə cavab verdi:

- Qardaşoğlu, səhvən sərhəd keçirlər? Bunlar bu məsələdə çox həssasdılar. Sərhədə göz bəbəkləri kimi nəzarət edirlər. Necə keçmisiniz sən canı?

- Bilmirəm, qaş qaralmışdı, hava da dumanlı idi. Maşının yanında yer salmışdıq. Oyananda nə maşın vardı, nə də dostlar.

Bir neçə saniyəlik sükutdan sonra yenə naməlum adam dilə gəldi:

- Buraxacaqlar üçünüzü də.

"Görəsən, təxmin edir, yoxsa bildiyi bir şey var? Birimiz casusluqda şübhəli bilinir, birimiz də axtarışdadır, bu qədər həngamədən sonra bizi necə buraxa bilərlər?" – deyə düşündü; az keçmiş maraq necə güc gəldisə, özünü saxlaya bilmədi: - Necə yəni buraxacaqlar? Dostum casusluqda şübhəli bilinir, sərhədi də qanunsuz keçmə məsələsi var. Nəyə əsaslanıb buraxılacağını düşünürsən?

Sualı boşluğa göndərdi və əvvəl cavab gəlmədi, hətta bir neçə saniyə sonra ona elə gəldi ki, başına hava gəlib, əslində, içəridə kimsə yoxdur və bayaqdan özü ilə danışır. Nəhayət naməlum adam boğazını arıtdı və sözə başladı:

- Bura Əcnəgşi şəhəridir. Bura gətirilmisənsə, deməli, dövlətə qarşı çıxmısan.

- Necə yəni dövlətə qarşı çıxmışam? Mənim heç sizin dövlətin varlığından xəbərim olmayıb, – yad həyəcanla naməlum adamın sözünü kəssə də, buna peşman olub susdu.

- Bayaq dedim axı, sərhəd həssas məsələdir. Onu pozaraq ölkədən getmək də, ölkəyə girmək də eyni dərəcədə ağır cinayətdir. Siz bilmədən sərhədi keçib dövlət avtoritetini zədələmisiniz. Burada məftillərin çevrələdiyi bir ovuc torpaq hər şeydən dəyərlidir – naməlum adam bir qədər ara verdi, yerə tüpürüb sözünə davam etdi, – bəlkə də, sakitcə yola vermək olardı. Amma sakinlərdən kimsənin sizi görmə ehtimalı böyükdür. Ona görə, sizi cəzalandırmalıdırlar ki, başqalarına dərs olsun...

Naməlum adam sözünü bitirər-bitirməz yenə qeybə çəkildi. Bu, artıq Yadın əsəbləri ilə oynamaq idi. Az keçmiş qaranlıqdan yenə həmin səs gəldi:

- Məsələ sərhəd və torpaq da deyil. Bütün bunlar sadəcə toxunulmaz sayılan bütünün hissələridir… Amma buradan qurtula da bilərsən…

Yenə sükut. Yadın buraxılacağına ümidi artmışdı, amma beynində yenə suallar vardı. Naməlum səs davam etdi:

- Bunun üçün dediklərimi etməlisən… - Səs kəsildi.

Yadın bədənindən üşütmə keçdi.

- Çalış ki, qürurunu kamerada qoyub gedəsən. – Naməlum adam yenidən davam etdi. - Orada mərdlik, namus, qeyrət məsələləri keçmir, bunu anlamağın gərək. Əlqərəz, çölə çıxmaq istəyirsənsə, deyilənləri et...

- Nəyi nəzərdə tutursan?

- Elə bunu. Deyiləni et, buraxacaqlar.

Yad növbəti sualını verməyə imkan tapmadı, qapı açıldı, içəri iki cüssəli adam girib qollarından yapışdılar və az qala sürüyə-sürüyə otaqdan çıxardılar.

Qarşısında, bəlkə də, bir saatdan çox ayaqüstə gözlədikdən sonra dəmir qapı şaqqıltı ilə açıldı və iki cüssəli adam bədəni çapıq-çapıq olmuş yarıçılpaq bir nəfərin qollarından tutub sürüyərək çölə çıxardı. Diqqətlə fikir verməsə də, ona elə gəldi, çapıqlar sözlər formasındadır. Dizlərinin yenidən əsməyə başladığının fərqinə varanda ağlından ani qaçmaq fikri keçdi, amma tez də unudub, qorxu içində növbəsini gözlədi. Bu, çox qəribə qorxu idi, indiyə kimi belə bir hissi yaşamamışdı. Dəqiqələr ötdükcə bu qorxu daha da güclənirdi.

"Çalış, qürurunu kamerada qoyub gedəsən. Bir də, orada mərdlik, namus, qeyrət məsələləri keçmir. Deyiləni et, vəssalam."

Bayaqkı naməlum adamın dediyi sözləri xatırlayanda bir qədər sakitləşdi. Deyiləni etsə, buraxacaqlar. Burada çətin bir şey yoxdur: sadəcə, deyiləni etmək gərək…

Qapısı aralı otaqdan "Növbəti!" əmri gələndə bilmədi nə etsin, içəri keçmək istəsə də, ayaqları sözünə baxmadı. Kobud əlin kürəyindən basıb onu içəri itələməsi ilə qapının şaqqıltı ilə bağlanması arasında iki-üç saniyə oldu.

İçəridə, gözlədiyinin tam əksinə, cüssəli, kobud və sifətindən zəhrimar yağan zabit yox, sısqa, eynəkli, təxminən əlli yaşlarında qarapaltarlı birisi və küncdə farağat durmuş sağlam bədənli, maskalı gənc vardı. Otağı ortadakı masa üzərində tavandan asılı qalmış sadə lampa işıqlandırırdı. Ümumən isə bir çarpayı, yanında qəribə cihaz, bir masa və iki stuldan başqa heç nə yox idi otaqda. Qarapaltarlı stula əyləşib əli ilə o biri stula işarə edərək yadı da dəvət etdi.

- Tanışlığa ehtiyac yoxdur, sizin barədə lazımi qədər məlumatlıyıq. Heyif ki, qəzavü-qədər sizi bura gətirib, bildiyim qədəri ilə bunu heç siz özünüz də istəməzdiniz… – Sınayıcı nəzərlərini düz yadın gözlərinə dikdi.

Qarşısındakı adamın gözlərinin birində bəbəyin olmamasının indi fərqinə varan Yad əsə-əsə başı ilə təsdiqlədi.

- Amma neyləmək olar, bəzən proseslər nəzarətdən çıxır və istəmədən bəzi addımları atmağa məcbur oluruq…

Qarapaltarlı gülümsədi, amma təbəssümü Yadı ürkütdü. Sifətinə qəribə görkəm verən nəsə də vardı, amma nə idi o qəribəlik, tapa bilmirdi.

- Siz sərhədi keçmisiniz. Yəqin bura gələnə qədər sizə deyiblər, amma bir də mənim ağzımdan eşidin. Bizdə sərhəd toxunulmazdır, onu keçmək – fərq etməz, ölkəyə daxil olmaq, ya xaric olmaq, dövlətçiliyimizə sataşmaqdır. Düzdür, siz səhvən keçmisiniz, bağışlamaq olardı, amma heyif ki, tək olmamısınız, üstəgəl sakinlərdən sizi görənlər olub, – qarapaltarlı cibindən şəkillər çıxarıb yadın qarşısına düzdü.

Yad, otluqda uzandığı şəkillərlə yanaşı əlində telefon setin olub-olmadığını yoxlayarkən çəkilmiş şəkillərini görəndə Qarapaltarlının nəzərdə tutduğu sakinin kim olduğunu bildi.

- Vətəndaşlarımız dövlətçiliyimizə çox sadiqdirlər, odur ki, bu səhvi görməzdən gələ bilmədilər. Amma eyni zamanda, sizin sərhəddən səhvən keçdiyinizi də biz görməzdən gəlsəydik, vətəndaşlar çaşqınlığa düşərdilər… – Qarapaltarlının sifətində yenidən çoxmənalı təbəssüm peyda oldu.

Yadın ağlından “Daha hamısının boğazına boyunduruq keçirəndə ağızları nədir sadiq olmasınlar” düşüncəsi keçəndə qarapaltarlının üzündəki təbəssüm qəfil yoxa çıxdı. Sifətinə çökən ciddilikdən Yadın bədəninə vicvicə düşdü.

- Boğazlarına saldığımız boyunduruq deyil, şərəf halqasıdır!

Yadın gözü alacalandı. Çənəsini yenidən əsməyə başladığını qarapaltarlı da hiss etdi.

- Elə bir şərəf halqası ki, dövlətçilik onun üzərində inşa olunub. O bizim gözümüz və qulağımızdır, o şərəfə əl uzadanların başını elə o halqa özü qoparır!

Qarapaltarlı qalxıb otaqda var-gəl etməyə başladı. Təxminən iki dəqiqədən sonra sükutu yenə özü pozdu:

- Dövlət ən başda gəlir. Müqəddəs və toxunulmazdır. O olmasa, qaragüruh bir-birinin ətini diri-diri yeyər. Doxsanlardakı hərc-mərclik dövrünü yaşamış adamlarıq. İndinin özündə xalq o günləri lənətlə xatırlayır və bu günümüzə şükür edir! Qaragüruhu isə gərək ancaq nəzarətdə saxlayasan, nəzarətdən çıxdısa, destruktiv qüvvəyə çevrilir, kor-koranə hərəkət edib qarşısına çıxanı dağıdıb-tökür.

Yad başı ilə təsdiqlədi; daxilən də belə düşünürdü. "Doğrudan, haqq sözdür! Kütləni gərək nəzarətdə saxlayasan, əks halda, hər şeyi alt-üst edər!"

Qarapaltarlı məmnunluqla gülümsəyib davam etdi:

- Nəzarət gücdür, dövlətdir, hər şeydir! Bu gün biz düşüncələrə də nəzarət edirik, çünki ən böyük cinayətlər birinci düşüncədə doğulur, yetişir və əmələ çevrilir. Düşüncəni formalaşdıran hər şeyə də nəzarət edirik. Əsas bizim ali məqsədimizdir, ona xidmət edən hər vasitə müqəddəsdir!

Qarapaltarlı yenidən masaya əyləşdi. Düz yadın gözünün içinə baxıb durdu. Naməlum adamın tövsiyələri hələ də beynində dolaşırdı: "Orada mərdlik, namus, qeyrət məsələləri keçmir. Deyiləni et, vəssalam."

- Neçə nəfər idiniz?

Qəfil verilmiş sual yadı çaşdırdı. O dəqiqə qəzeti xatırladı. Yoldaşlarından biri tutulmuşdu, özü də burada. Üçüncünün hələ də azadlıqda olma ehtimalı vardı. Bəlkə də, sağ-salamat sərhədi keçib qaçmışdı. Həm də başlarına nə gələcəyini bilmirdi, "Üç nəfərik" desəydi, o üçüncü yoldaşı barədə sorğuya tutacaqdı.

- İki.

Qarapaltarlı yenə gülümsədi, amma təbəssümündə həminki istehza vardı.

- Sənə bayaq nə dedim? Unutdun, deyəsən.

"Bir halda ki, üç nəfər olduğumuzu bilir, niyə soruşur? Nə etmək istəyir?" – deyə düşünən yad nəhayət dilləndi: - Üç nəfər.

- Çox dostcanlısan. O biri yoldaşın ikinizi də satdı… – qarapal-tarlı əlini ölçə-ölçə etinasız səs tonu ilə söylədi.

"Yalan deyir! Belə bir şey olmayıb, məndən söz almaq istəyir"

- Mən səndən söz almaq istəsəydim, bunu başqa yolla edərdim, – sanki onun ürəyini oxuyan qarapaltarlı baxışları ilə çarpayının yanındakı cihazı göstərdi, – inanmırsan mənə?

Qorxudan dili söz tutmayan yad çətinliklə özünü toparlayıb "Yox, inanıram" deyə bildi.

- Dostlarının adları və soyadları nədir?

Yad duruxdu. "Nəyin bahasına olursa-olsun, bunu məndən ala bilməyəcəksən!"

- Sualı bir də verim?! Deyəsən, eşitmədin. Dostlarının ad və soyadları!

Yad susdu. Qarapaltarlı bu dəfə qəhqəhə çəkib əlini stola vurdu.

- Heç nə, işimiz gücümüz qurtarıb, məzələnirik sizinlə! – Sifətinə qəfil ciddilik çökdü. – Qurtar daha, üzünə gülürəm, götün əldən getməsin!  O biri dılğırın adı nədir?

Yad susdu. "Əgər belə israrla istəyirsə, mütləq ki boşuna deyil, bir məqsədi var. Deməyəcəyəm, istəyirsən, öldür, yenə deməyəcəyəm!"

- Yaxşı. Bunu özün istədin, – qarapaltarlı əli ilə qapının ağzında duran maskalıya işarə etdi. Maskalı qapını açıb çölə çıxdı, təxminən beş dəqiqə sonra yarıçılpaq bir nəfərlə qayıtdı. Yadın rəngi ağardı – maskalının yanındakı Samir idi.

- Xoş gördük bir daha, Samir, – qarapaltarlı yaxınlaşıb əlini onun çiyninə qoydu.

Yadı ən çox qorxudan içəri girəndən bu yana Samirin bircə dəfə də onun tərəfə baxmaması və qarapaltarlı ilə səmimi salamlaşması idi. Biləyindən adını aydın oxumaq olurdu, amma qan quruyub qartmaqlamışdı. Bədəninin başqa heç bir nahiyəsində qançır gözə dəymirdi.

- Yoldaşın bizi incidir. Nə məsləhət görürsən? O biri yoldaşın adını ondan necə alaq?

Samir ona saymazyana nəzər yetirib gülümsədi, biləyini qaldırıb göstərərək cavab verdi:

- Cavab vermirsə, biz alarıq. Qətiyyən narahat olma, bu iş mənlikdir.

Yad müqavimətini itirmişdi. Son iki gündə bir çox anormal hadisələrlə qarşılaşmışdı, amma bunu dərk etməkdə şüuru aciz qaldı. Elə bir məqam idi ki, heç qorxa da bilmədi, Samirlə qarapaltarlının dialoqunu qımıldanmadan izləyirdi.

- Sənə inanıram, Samir. Biz bacarmadıq, gör nə edirsən. Elə et ki, qayıdanda yoldaşın adını onun ağzından eşidim.

- Narahat olma. Dedim axı, bu iş mənlikdir. Naz eləyir, mən başa salaram onu.

Samiri tanıya bilmirdi. Qarşısındakına elə özgə münasibət bəsləyirdi ki, elə bil iki gün qabaqkı Samir deyildi. Onun çox amansız rəftara və insan şüuru dərk etməyəcək təzyiqlərə məruz qaldığını, yaddaşı silinərək manqurtlaşdırıldığını düşünəndə dəhşətə gəldi. Ayağa qalxıb dostunun adını söyləmək istəsə də, dayandı, içindən bir səs ona “Bunu etmə!” deyirdi.

- Yaxşı. Biz qayıdacağıq.

Qarapaltarlı ilə maskalı otağı tərk etdi. İndi içəridə Samirlə ikisi qalmışdı.

Samir qapıya yaxınlaşıb dinlədi, addım səslərinin uzaqlaşdığına əmin olub yaxınlaşdı və stula əyləşdi.

- Səhərdən özümü qoymuşam meymunluğa. Gəl çıx da sən də, gizlənmək vaxtıdır? Hələ o biri dəmşalağa bax, ağıllı çıxıb guya! Bir yolla maşını işə sala bilib. Fikirləşib ki, maşın əlinin altında, bütün şəhəri fırlanıb bizi axtarıb, komendant saatı olduğu üçün tutub basıblar içəri, – səsini qısıb davam etdi, – inanırsan, başıma itin oyunu açdılar. Sizin adınızı istəyirdilər, dirəşib demədim deyə sarıdılar kravata, başıma da gic-gic şeylər bağladılar. Bu çaqqal idi, yanında da özü kimi ikisi vardı. Öz aralarında mübahisə edirdilər. O biri deyirdi, yadellidir, işə yaramayacaq, bu çaqqal deyirdi, yoxlayaq, alınacaq. Tutdum ki, nəsə hipnoz zad temasıdır. Gördüm təsiri yoxdur, özümü qoydum mallığa. Bir dənə orada poxu çıxdı ki, qoluma adını yazdırdılar, amma day dirəşmədim, eşitmişdim ki, tutublar səni də.

- İndi nə edək?

- Heç nə. Bunların məqsədi bizi sındırmaqdır. Ən salamatı al bu lezvanı, Zakirin adını yaz qoluna. Buraxarlar yəqin. Başla, tez ol, gələcək indi.

Əlinə lezvanı yenicə götürmüşdü ki, qapı tərəfdən gələn qəhqəhə səsinə diksinib əlindən yerə saldı. Qarapaltarlı qapının ağzında durub əlini-əlinə vuraraq gülürdü. Bu gülüş o qədər təbii alındı ki, dostlar da bir-birilərinə baxıb gülməkdən özlərini saxlaya bilmədilər.

- Nə məzəli adamlarsınız ə siz? Ağıllı çıxmısınız da indi, eləmi?

İçəri sükut çökdü. Qarapaltarlı başını bulayıb bayıra çıxdı, az sonra içəri girən iki nəfər maskalı onun və Samirin qolunu burub yerə uzatdı. Hiss etdi ki, sol buduna iynə batırdılar. Qışqırmaq istədi, amma səsi çıxmadı. Əvvəl qulaqları cingildədi, gözünü qaldırıb başının üstündə qarapaltarlını, dünən səhər rastlaşdığı çobanı, ev sahibini, Samir və Zakiri gördü. Ev sahibi dizini yerə atıb ağlayırdı, çoban isə əlində telefon onun şəklini çəkirdi. Sonra ev sahibinin başını kəsdilər. Baş yerə düşüb bir xeyli yuvarlandı və dayandı. Zakir yaxınlaşıb başa təpik vurdu. Baş Samirin qabağına düşdü, o da təpik vurdu və göydə uçan baş divara dəyib qarpız kimi partladı. Göz qapaqları yavaş-yavaş yumulurdu, gücbəla ilə dodaqları arasından çıxardığı "Təslim oluram!" sözünü yalnız qarapaltarlı və iki maskalı əməkdaş eşitdi. Gözlər yumuldu. Hər şey bitdi…

***

Gözünü açanda üfüq yavaş-yavaş qızarırdı. Əvvəl ayağa qalxmağa ərindi, bir xeyli gözlərini mavi ənginliyə dikib durdu. Sonra uzandığı şehli otların üstündə dik oturub gözünü ovxaladı, başı möhkəm ağrıdığı üçün boynunu çətinliklə tərpətsə də, o üz-bu üzə çevrilib ətrafına boylandı. Samir və Zakir oyanıb yer-yığış edirdilər. Duman çoxdan çəkilmişdi, artıq tərpənmək olardı. Ayağa qalxmaq istəsə də, alınmadı.

- Maşını necə edək? - elə yerindəcə mızıldandı.

- Həll etdim özüm. - Zakir baqajı bağlayıb əlini üstünə silə-silə cavab verdi. - BMS-də nasazlıq var imiş, bir az qurcalayan kimi işə düşdü. Dur sən də, bayaqdan çağırırıq, oyanmırsan. Yemək yeyib tərpənək day.

Birtəhər ayağa qalxıb əl-üzünü yudu. Başının ağrısı dayanmırdı.

- Maşında parasetamol yoxdur?

- Bardaçokda olmalıdır, bax, görəcəksən.

Samir yerə süfrə salıb tələsik soyduğu kartof, sosiska və soğanı üstünə düzdü. Qolunu çırmalayıb həvəslə işə girişdiyindən zəif səslə verilən sualı tutmadı.

- Ə, səninləyəm. Biləyinə nə olub?

Samir əlini saxlayıb biləyinə baxdı. Gördüyü qaraltıya özü də diksindi. Tünd göy-bənövşəyi rəngli hissə yetərincə böyük olsa da, ağrı vermədiyi üçün hiss etməmişdi.

- Yəqin yuxuda çox çabalamışam, harasa dəyib göyərib. Görəsən, qanqrena olmaz ki?

- Biləyini yaxın tut, baxım, – qaraltının üstündə cızıqlar vardı, – ha tərəfdə yatmışdın sən? Kol cırıq-cırıq eləyib qolunu, necəb oyanmamısan?

- Nə bilim ee, gedərik həkimə, heç zad olan deyil, ağciyər olmayın.

Az sonra süfrəni də yığışdırıb maşına mindilər və şəhərə doğru yol aldılar. İstər yemək yeyə-yeyə, istərsə də yol boyu heç biri boğazlarındakı halqanın fərqinə varmadı. Bu şey həmişə boğazlarında olmuş kimi, bunda qəribə heç nə görmürdülər. Bu sualı onlara şəhərdə də verəcəkdilər. Məntiqli cavabları olacaqdımı?!

## EPİLOQ

Bəşər övladına ətrafında olan hər şeyi görmək imkanı verilmir.

Bəsirət gözü də hər kəsdə yoxdur ki, boynundakı halqanı görsün. İnsanlara bəsirət gözünü açmaq üçün kömək gərək.

Bu baxımdan sözün gücünə inanıram.

Ona da əminəm ki, insanlar gec-tez o halqanı görə biləcək və ondan azad olmaq üçün səylərini əsirgəməyəcəklər.

Odur ki, qətiyyən bədbin deyiləm və oxucularımı da ümidsiz olmamağa çağırıram.

Gecənin ən qaranlıq dəqiqələri sübhə yaxın olar...